## VƏHİD QƏZVİNİ VƏ ONUN TÜRKCƏ DİVANI

İmadüddövlə Mirzə Məhəmməd Tahir Vəhid Qəzvini XVII əsrin görkəmli dövlət xadimi, şairi və tarixçisi olmuşdur. O, həmin əsrin əvvəlindən sonuna qədər doxsan beş ilə qədər ömür sürmüş, beş Səfəvi şahının hakimiyyəti dövründə hökumət idarəsində çalışmış, mühasib və vəqayenəvislik vəzifəsindən vəzirlik və sədri-əzəmliyə qədər yüksəlmişdir.

Tədqiqatçılar göstərirlər ki, Məhəmməd Tahir h.1015-ci ildə (m.1606-1607) orta təbəqədən olan dövlət xidmətçisi Mirzə Hüseyn xanın ailəsində Qəzvində dünyaya gəlmiş, uşaqlıq və gənclik illərini burada keçirmişdir (22, s.79). «Təzkirətüş-şüəra» müəllifi M.T.Nəsrabadinin verdiyi məlumata görə, təhsilini qurtardıqdan sonra Vəhid «divani-alinin tövcih idarəsinin başçısı Mirzə Salehin rəhbərliyi altında işə qəbul edilir və rəsmi dəftərlərdən birində qeydlər aparmaq ona tapşırılır. Mirzə Salehin ölümündən sonra onun yerinə keçən Məhəmməd Tahir bir azdan Sarı Təqi adi ilə tanınan dövrünün görkəmli dövlət xadimi, Şah Səfinin (1629-1642) və II Şah Abbasın (1642-1666) baş vəziri olmuş Mirzə Məhəmməd Təqi Etimadüssəltənənin yanında işləməyə başlayır (20, s.26). Sarı Təqi yüksək vəzifəli sərkərdələrin sui-qəsdi nəticəsində öldürüldükdən sonra Xəlif sultan ikinci dəfə dövlətin baş vəziri vəzifəsinə təyin olunur (1645) və o bəzi tərəddüdlərdən sonra Məhəmməd Tahirin dövlət vəzifəsini təsdiq edir. Xəlif sultanın zəmanəti ilə Məhəmməd Tahir vaqiənəvis-saray tərixçisi təyin olunur. Ona II Şah Abbasın hakimiyyəti illərinin tarixini yazmaq tapşırılır. II Şah Abbasın oğlu Şah Süleymanın (1666-1694)

hakimiyyəti dövründə Şeyx Əli Zəngənənin vəfatından sonra, h.1101-ci ildə (m.1689-1690) Vəhid «İmadüddövlə» titulu ilə şahın baş vəziri-sədri-əzəmi təyin edilir. Şah Sultan Hüseynin (1696-1722) hakimiyyətinin ilk illərində Mirzə Tahir dövlət işlərindən uzaqlaşır və h. 1112-ci ildə (m.1700-1701) vəfat edir. Lütfəli bəy Azər Vəhidin çox sağlam adam olduğunu qeyd etmişdir (1,s.234).

Mirzə Məhəmməd Tahir təhsilli bir ailədən olmuşdur. Nəsrabadi öz təzkirəsində onun böyük qardaşı - uzun müddət Etümadüddövlə Mirzə Talib xan Ordubadinin vəziri olmuş Mirzə Fasehin, qardaşı «Valeh» təxəllüsülü Mirzə Yusifin, digər qardaşı – Qəndəhar vilayətinin vəziri, «Asəf» təxəllüslü Mirzə Əminin, başqa qohumlarının adını çəkir (20,s.80).

Bir sıra mənbələr Vəhidin bədii irsi barədə məlumat verirlər. Lütfəli bəy Azər onun 90 min, Şeyx Məhəmməd Həzin isə 60 min beytdən ibarət farsca divanının olduğunu bildirmişdir (22,s.80).

Nəsrabadi təzkirəsində yazır: «Bu cənabın məsnəvi, qəsidə və qəzəllərdən ibarət divanı təxminən 30 min beyt həcmindədir. Bütün elmlərdə yeganə olduğuna görə o özünə «Vəhid» təxəllüsünü seçmişdir (20,s.27). Həzin onu  Vəhid əz-zəman - zamanın yeganəsi adlandırmışdır (18,s.2197).

Görkəmli Azərbaycan alimi Məhəmmədəli Tərbiyətin verdiyi məlumata görə, Vəhidin yüz min beytdən artıq əsərləri, o cümlədən II Şah Abbasın tarixi haqqında yazdığı «Abbasnamə» və münşəatı vardır (bax: 7.s.117). Vəhidin münşəatındakı  qeyddə deyilir ki, o öz şeirlərini təshih etdirmək məqsədi ilə Mövlana Saib Təbriziyə göndərmiş, Saib də bu əsərlərdən yüz iyirmi beyt seçərək öz bəyazına daxil etmişdir (bax: 7,s.117).

Məhəmməd Tahirin maraq dairəsinin çox geniş olduğunu, tarix, ədəbiyyat, fəlsəfə, hərb elmini əhatə etdiyini göstərən A.Rəhmani

onun aşağıdakı əsərlərinin adını çəkir:

«Riyaz ət-təvarix» («Tarixlər bağçası»). Səfəvilər sülaləsinin başlanğıcından h.1070-ci ilə (m.1663-1664) qədərki dövrü əhatə edən tarixi əsərdir. «Abbasnamə» bu əsərin üçüncü, sonuncu hissəsini təşkil edir.

«Münşəat» dövrün müxtəllifi rəsmi və qeyri-rəsmi şəxslərinə yazılmış məktublar məcmusudur. Vəhd dövrünün görkəmli stilisti sayılır. «Münşəat»da müəllifin zərif, lakin mürəkkəb-təmtəraqlı üsluba malik olduğu görünür. Bu əsər hələ XIX əsrdə Hindistanda dəfələrlə çap edilmişdir (Kəlküttə, 1826, Laknau, 1844, 1868, 1873).

Şairin iri həcmli farsca divanı dünyanın bir sıra kitabxanalarında mühafizə olunur.

Vəhid bir sıra farsca poemaların da müəllifidir: «Xəlvəti-raz» («Sirrin xəlvəti»), «Nazü niyaz», «Gülzari-Abbasi» («Abbasın güllüyü»), «Dər vəsfi-Humayun təpə» («Humayun təpənin vəsfi»), «Dər tərifi-nərd» («Nərd barədə»), «Fəthnameyi-Qəndəhar» («Qəndəharın fəthi barədə»), «Dər zikri və məsrəfi ədəvati-cəngi» («Hərb alətlərinin adları və istifadəsi barədə» (22,s.81).

A.Rəhmaninin fikrincə Vəhidin «Abbasnamə» əsəri XVII əsrin ortalarına dair tarixi mənbə kimi Səfəvi dövrü tarixşünaslığında layiqli yer tutur. II Şah Abbasın əmri ilə bu əsəri yazmış Məhəmməd Tahir iyirmi ildən artıq bir dövr ərzində nəhəng Səfəvi dövlətinin siyasi, sosial-iqtisadi və mədəni həyatının ən vacib məsələlərini əhatə etmişdir. Bu əsəri eyni mövzuda yazılmış digər tarixi mənbələrdən fərqləndirən başlıca cəhət də elə bundan idarətdir (22, s.81).

Bunlardan başqa, AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda Məhəmməd Tahirin hesab elminə dair 2 fəsildən ibarət farsca dərsliyinin əlyazması aşkar edilibdir. Əsər M-95 (IV) şifri

altında saxlanan əlyazmanın 88b-124b vərəqlərini əhatə edir, qara tuşla, kalliqrafik nəstəliq xətti ilə köçürülmüşdür. Burada tam və kəsr ədədlərlə hesab əməllərindən, həndəsi fiqurların sahəsinin ölçülməsi qaydasından bəhs olunur, hesaba dair çoxsaylı nümunələr vardır (13).

Vəhid əsərləri külliyyatının bir nüsxəsi də Berlin Dövlət Kitabxanasının əlyazmalar xəzinəsində saxlanılır (6, s.271). Ms.orient. Fol.3314 şifri altında mühafizə olunan 487 vərəqdən ibarət bu əlyazmanın 30 vərəğinə (1b-30a) nəstəliq xətti ilə şairin Azərbaycan türkcəsindəki divanı köçürülmüşdür. Bu divan 1842 beytdən ibarətdir. Əlyazmanın əvvəlində saraya məxsus iki möhür vardır. Sondakı (v.487b) kolofonda bu sözlər yazılmışdır: «Qəd fərəğə min təsvidi-külliyyati-divan min təsnifi vəhidül-əsr və fərid-əd-dəhr Mirzə Məhəmməd Tahir Vəhid betarixe şanzdəhhom şəhri-məhərrəm əlhəram əhde-cüluse-mübarək Bahadur şah mütabeq səneye 1119 hicri». (Tərcüməsi: «Əsrin yeganəsi və dövrün misilsizi Mirzə Məhəmməd Tahir Vəhidin əsərlərindən ibarət olan divan külliyyatının köçürülməsi qurtardı. Məhərrəm ayının 16-sı tarixində, Bahadur şahın taxta çıxdığı h.1119-cü ildə» (11,v.487b). Buradan əlyazmanın miladi tarixlə 1707-ci ilin 12 aprelində köçürüldüyünü öyrənirik. Bu ildə hakimiyyətə çıxan şəxs isə ehtimal ki, Hindistanda hökmdar olmuş Baburi Övrəngzibin oğlu, Şah Aləm adı isə tanınan Bahadur şahdır (1643-1712). Tarixi mənbələrin göstərdiyinə görə o, 1707-ci ilin 26 aprelində taxta çıxmış, hakimiyyəti tarixini atasının vəfatı xəbərini aldığı 1707-ci ilin 22 martından hesab etmişdir (9.s.220).

Vəhid Qəzvinin türkcə divanının bizə məlum olan bu yeganə nüsxəsini ilk dəfə aşkar edərək onun surətini bizə göndərmiş Almaniyada yaşayan həmvətənimiz, ədəbiyyat tədqiqatçısı

Məhəmmədəli Hüseyniyə öz minnətdarlığımızı bildiririk. Əlyazmanı ətraflı nəzərdən keçirdikdən sonra belə nəticəyə gəlirik ki, nüsxə türk dilini bilməyən bir katib tərəfindən köçürülmüş, o bir çox sözləri başa düşmədən onların «şəklini çəkmiş», çoxlu təhriflərə yol vermişdir. Bu səbəbdən bərbad vəziyyətə düşmüş mətn çətinliklə oxunur. Elə buna görə də ilk dəfə «Ədəbiyyat tariximizdən səhifələr» adlı kitabında (7,s.119-125) Vəhidin türkcə şeirlərindən nümunələr verən M.Hüseyni oxuculara cəmi 4 şeir təqdim edə bilmişdir. (Dəqiqliyə böyük fikir verən Məhəmmədəli bəy hansı sözünüsə oxuya bilmədiyi və ya oxunuşunda şübhələndiyi şeirləri kitabına daxil etməyibdir).

Qeyd etmək istərdik ki, V.Qəzvininin Təbriz Milli Kitabxanasında saxlanan 192 vərəqdən ibarət farsca divanının 4 vərəğində (v.115a-119a) şairin türkcə şeirləri köçürülmüşdür ki, M.Hüseyninin köməyi ilə onları da əldə edə bildik (burada türkcə cəmi 117 beyt vardır) (12). Təəssüf ki, bu əlyazmanın da bir sıra yerləri pozulmuşdur. Vəhidin türkcə şeirlərini müasir əlifba ilə çapa hazırlayarkən bu nüsxədən də istifadə etmişik.

Vəhidin Azərbaycan türkcəsindəki divanı 140 beytdən ibarət məsnəvi (1b-3b) ilə başlanır. Saqinamə məzmunlu bu şeirdə baharın gəlişi, təbiətin oyanışı, gözəllikləri təsvir olunur. Şair saqiyə müraciət edir, baharın gəlişi münasibəti ilə ondan badə istəyir. Əsəri oxuduqca görürük ki, gözəlliyi vəsf edilən gül-çiçəklər, müxtəlif bitkilər şah sarayının bağına məxsusdur. Qızıl gül qızılbaşa, bənövşə tüfəngini gizlətmiş yeniçəriyə, nilüfər firəng (Avropa) libası geyinmiş şəxsə, qırmızı gilas qarğa gözünə, ərik ağacı çılçırağa bənzədilir.

Vəhid göstərir ki, şah sarayının əzəmətli və gözəl binası, həyətdəki dəryaça (hovuz) buraları cənnətə çevirmişdir. Şair

vətənində bahar bayramı keçirildiyinə görə fəxr etdiyini, digər xalqların nümayəndələrinin buna görə bizə həsəd apardığını bildirir:

Ərəb qafillərindən bir yeganə,
Demiş bir nüktə əlhəq arifanə.
Ki, bu bayram əgər mübhəm olaydı,
Bir bayram sarayı kəm olaydı.
Olaydı gər bu ay ilhamdan bədr,
Bizə bu gün olurdu leylətül-qədr (11.v.3b).

Şeirdə Şah Süleymanın adı çəkilir.

Professor Turxan Gəncəyi Səfəvi sarayında məliküş-şüəranın üzərinə düşən vəzifələr barədə yazır: «Onun (məliküşşüəranın – P.K.) vəzifəsi bu idi ki, hər il günəş Qoç bürcünə daxil olanda qabaqcadan padşahın tərifinə, yaxud baharın təsvirinə həsr olunmuş bir qəsidə yazsın və novruz bayramı günü onu gətirib hamının yanında padşahın müqəddəs hüzurunda oxusun, padşahın yeni tikilən bina və imarətləri barədə «tarix» desin və şərəfli əmrin verildiyi istənilən mövzuda məsnəvi və qəsidə qələmə alsın» (5.s.25). T.Gəncəyi XVII əsrdə yaşamış digər Azərbaycan şairi Təsir Təbrizinin (1655-1719) bəzi türkcə qəzəl, qəsidə və məsnəvilərini (Şah Süleymanı mədh edən qəsidə, Şah Sultan Hüseynin taxta çıxdığı tarixə həsr edilən qəsidə, əmrə əsasən yazılan türkcə bayram məsnəvisi, şahzadə Sultan Əkbər ibn Övrəngzibin gəlişinə həsr edilmiş qəzəl) nəzərdən keçirərək belə bir nəticəyə gəlir ki, iki Səfəvi hökmdarının zamanında məliküş-şüəralıq vəzifəsi faktiki olaraq onun üzərinə düşmüşdür (5.s.26).

Vəhidin türkcə divanına daxil edilmiş məsnəvi və qəsidələrinə baxdıqda görürük ki, şair Səfəvi sarayında məliküş-şüəra olmasa belə, onun bu şeirləri novruz bayramı və digər təntənəli şənliklər münasibəti ilə sarayda şahın hüzurunda oxunmaq üçün nəzərdə

tutulmuşdur.

Məsnəvidən sonra gələn 12 beytlik birinci qəsidə şah sarayında güzgülü taların (zalın) inşasına həsr edilibdir. Burada zalın gözəlliyindən, onun memarının zamanın özü olduğundan bəhs edən Vəhid bu zalın güzgülü divarlarının şahı görüb heyran olduğunu söyləyir:

Güzgü oldu sınığı sər ta pa,
Məhvdür şahə çeşmi-bidarı (11, v.3b).

Şeirdəki beytlərdən birində zalın inşa tarixini bildirən maddeyi-tarixə rast gəlilirk:

Salıb əda başın dedim tarix:
Ki, göz açmış təvilə taları (11, v.3b).

Beytin ikinci misrasındakı «göz açmış təvilə taları» sözləri əsasında tərtib edilmiş maddeyi-tarixdən saraydakı güzgülü zalın hicri tarixi ilə 1089, miladi tarixlə 1678-ci ildə tikildiyini öyrənirik. Bundan sonra gələn 50 və 27 beytdən ibarət olan iki qəsidə İsfahanın Cüneydabad məhəlləsinin tərifinə həsr edilibdir (11,v.3b-4b).

Qeyd etmək istərdik ki, Məhəmmədəli Tərbiyət «Danişməndani-Azərbaycan» əsərində Təsir Təbrizinin də İsfahanın müxtəlif yerlərinin gözəlliklərini vəsf edən şeirlər yazdığı barədə məlumat verir. M.Tərbiyət Təsirin bu mövzuda yazdığı əsərlərindən aşağıdakı məsnəvilərin adını çəkir:

«Gülzari-səadət» - «Xosrov və Şirin» vəznində və İsfahanın Səadətabad binaları və bağçalarının tərifinə yazılmışdır.

«Cahannüma» əsəri «Sirlər xəzinəsi» vəznində yazılmışdır. İsfahanın Fərəhabad binaları və bağlarının tərifi haqqındadır.

«Hüsni-ittifaq» - «Leyli və Məcnun» əsəri vəznində yazılmış və

Təft qəsəbəsi, onun suyu, havası, ağacları, meyvələri və gül-çiçəklərinin tərifi haqqındadır (27, s.333-334).

Məhəmməd Tahir qəsidələrində Cüneydabadı gözəllikdə sevgili yara, bahara bənzədir, onun könüldəki şövq atəşini yandırdığını söyləyir. Şair Cüneydabadı ruzigar dəftərinin şahbeyti adlandırır, onun bu gözəlliyini şahın lütfü ilə izah edir. Məhəlləni şahın yadigarı kimi dəyərləndirən müəllif böyük ehtiramla II Şah Abbasın və Şah Süleymanın adlarını çəkir. Vəhid Cüneydabadı xəstələri müalicə edən həkim saydığını bildirir, onu Müsəlman Şərqində ən yüksək qiymətləndirilən alim, təbiblərlə müqayisə edir:

Sənə vermiş yerini Əflatun,
Sən xüm içrə həkimi-danasən.
Tibdə qaimməqami-Calinus,
Sani ərseyn İbni Sinasən (11,v.4b).

Vərəq 4b-nin axırından divanın sonunadək (v.30b) şairin qəzəl, qitə, nəzm və təkbeytləri ayrı-ayrılıqda deyil, əlifba sırası ilə köçürülmüşdür.

Qeyd etmək istərdik ki, Vəhidin türkcə şeirləri son zamanlara qədər əlimizdə olmasa da, XVII əsr Azərbaycan şairi Qövsi Təbrizinin Vəhidin türkcə qəzəllərinə yazdığı nəzirələrdən xəbərimiz var idi. Qövsi Füzuli və Nəvaidən başqa bir neçə müasirinin – Vəhidin, Sahir və Ağarəzi (ehtimal ki, Təsir Təbrizinin vəfatına şeir həsr etdiyi, Ağarəzi adı ilə tanınan, «Məsrur» təxəllüslü, «Lisanül-xəvas» əsərinin müəllifi Həsən oğlu Məhəmməddir. Bax: 27, s.335) adlı şairlərini qəzəllərinə nəzirələr yazmış, nəzirələrinin son beytində ehtiramla onların adını çəkmiş, şeirlərindən bir misra vermişdir. Qövsi V.Qəzvini qəzəllərinə yazdığı aşağıdakı nəzirələrdə onun adını çəkir:

Nə yaxşı söyləmiş, Qövsi, Vəhidi-pakgövhər kim:

«Məni yandırdı bir atəş ki, düşməndən irağ olsun» (26,s.133).

Nə yaxşı söyləmiş, Qövsi, Vəhidi-aləmi-məni:

«Nigahi biməhabadır dili-bitab dilmacı» (26.s.393).

Məhəmməd Tahirin türkcə divanının Berlin nüsxəsində Qövsinin bir misrasının iqtibas etdiyi bu şeirlərə rast gəlirik.

Vəhidin «Bağrımı qan eylədin, ey dilbəri-xunxar, hey» (11,v.28a) misrası ilə başlanan şeirinə Qövsinin «Bağrımı qan etdi dövran, naleyi-sərsar, hey» (26, s.362) və «Xub yetişdin, yaxşı aldın könlümü, ey yar, hey» (26, s.373) misraları ilə başlanan nəzirələri də aşkar edildi. Adətən şeirinə nəzirə yazdığı şairin adını çəkən, onun bir misrasını iqtibas edən Qövsi Vəhidin rəməl bəhrində (fA'İlAtün fA'İlAtün fA'İlAtün fa'İlat) yazdığı 9 beytlik bu qəzələ yazdığı cavablarda bunları etməmişdir. Vəhid şeirində sevgilisinin rəhmsizliyindən şikayət edir, bununla bərabər onun yolunda hər bir dərdə dözməyə hazır olduğunu bildirir, «Əndəlibəm, dərmənəm gül, gəlmişəm dərdin dərim» deyir. Qövsi bu şeirə 9 beytlik birinci nəzirəsində həm də dövrandan şikayət edir, gərdunun onu yandırdığından danışır. 13 beytlik ikinci cavabında Qövsi nazənin yarın ona yetişdiyindən, könlünü aldığından bəhs edir. Birinci nəzirə məzmunca Vəhid şeirinə daha yaxındır.

L.Azər təzkirəsində V.Qəzvininin ünvanına deyilmiş tərifli şeirləri onun tutduğu yüksək mövqe ilə izah edir (1, s.234). Lakin fikrimizcə, şairin yaradıcılığı həqiqətən də deyilən təriflərə layiqdir, Vəhidin türkcə şeirləri XVII əsr Azərbaycan ədəbiyyatının ən gözəl poetik nümunələrindən sayıla bilər. Qövsi nəzirə yazarkən yalnız zövqünə uyğun gələn, yüksək poetik dəyərə malik şeirləri seçmişdir. Bu nəzirələrdə işlədilən «Vəhidi-pakgövhər», «Vəhidi-aləmi-məni» kimi ifadələri heç də şişirtmə, boğazdan yuxarı deyilmiş tərif kimi başa düşmək lazım deyil.

Qövsi tərcibəndlərindən birində Mirzə Tahirin Təbrizdəki bağını, bu bağın gözəlliklərini tərif edir:

Ol bağda ki, eylədi Mirzə onu zahir.
Mirzə ki, onun Həqq ləqəbin eylədi Tahir.
Ol bağda ki, ayineyi-dövr nümadır,
Firdövs onunla olu rifətdə nə qadir.
Təsvir edə bilməz onu yüz rəng ilə Mani,
Təqliq edə bilməz onu neyrəng ilə sahir.
Heç fərqi onun rövzeyi-rizvanilə yoxdur,
Ol cənnəti-qaibdirü bu cənnəti hazır …(26, s.433).

Şair bu bağın yerini də dəqiq göstərir, çox sevdiyi vətəni Təbriz şəhərinin adını qürurla çəkir:

Bir bağda ki, eylədi Təbrizi gülüstan,
Ol bağ ki, bir guşəsidir rövzeyi-rizvan.
Bir həddi Səhənd olmuş, o bir həddi Urumi,
İki yanı Sürxabdır, ol kuhi-Bədəxşan… (26,s.433).

Təsvir elə dəqiqdir ki, şeirə əsasən indi təxmini olsa da, həmin bağın yerini tapmaq olar. Görkəmli ədəbiyyatşünas alim Salman Mümtaz Qövsinin V.Qəzviniyə münasibəti barədə yazır: «Qövsi dahi şairimiz olan Molla Məhəmməd Bağır Füzulidən mütəəssir olduğundan başqa, bir də Azərbaycan əazimi-şüərasından məşhur Vəhidin təsirindədir. Vəhid yuxarıda adı zikr olunan Mirzə Tahirin şeirdə işlətdiyi təxəllüsüdür ki, bunu Şarl Rio anlamamışdır… Onun şeirləri dörd, yəni türk, fars, ərəb və hind dillərində doxsan min beytdən ibarətdir. Təməllüq və təbsəbəs bilməyən Qövsinin Mirzə Tahir Vəhid bağına nəzmən yazdığı tövsif cayihə qoparmaq fikri ilə olmayıb, yalnız o böyük ustada öz səliqeyi-təbini göstərmək və şeirlərini ona bəyəndirmək niyyəti ilə olmuşdur (19, s.103).

Vəhidin haqqında danışdığımız türkcə divanında qəzəl, qitə,

nəzm və təkbeytlər hər biri ayrıca verilməmiş, əlifba sırası ilə düzülərək qarışıq köçürülmüşdür. Hansı səbəbdənsə Vəhidin bəzi qəzəllərinin sonunda şairin təxəllüsü verilməmişdir. Məlum olduğu kimi, nəzm və ya mənzumə şəkil və qafiyə baxımından eynilə qəzələ bənzəyən, yalnız məxləs beytinin olmaması və müxtəlif mövzularda (təkcə lirik mövzuda deyil) yazılmasıyla qəzəldən fərqlənən klassik şeir janrıdır (8,s .57). Bu tərifə əsasən son beytində müəllifin təxəllüsü qeyd edilməyən qəzəl formalı şeirlər nəzm adlandırılmaldır. Divanda elə şeirlər vardır ki, onların məzmunu tamamilə qəzəl janrına uyğun gəlir (məsələn, Füzulinin «Görgəc» rədifli qəzəlinə yazılmış nəzirə), lakin son beytdə müəllifin təxəllüsü yoxdur. Şairin divanında qəzəl janrının tələblərinə mövzu və formaca tam uyğun gələn, sonda Vəhidin təxəllüsü qeyd edilmiş 40 qəzəl vardır. Digər şeirlər özəlliklərindən danışdığıız nəzm, ilk beytinin misraları qafiyələnməyən, mətlə  və məqtə beytləri olmayan qitə  və təkbeytlərdir.

Vəhid şeirlərinin çoxunu fars dilində yazmışdır. O zaman farsça çoxsaylı şeirlər yazan bir sıra Azərbaycan şairləri ana dilində əsər yazmağı, divan tərtib etməyi (bəzən həcmcə kiçik olsa da) özlərinə borc bilirdilər. Məsələn, «Zəfər» təxəllüslü Mürtəzaqulu xan Şamlu 1669-cu ildə səksən yaşında tərtib etdiyi türkcə divanının dibaçəsində yazır: «…Çün səfheyi-ruzigarda yadigar qalmaq üçün xatirə yetişdi ki, farsi əşarı gərib yüz bin beytə yetişmiş idi, bir neçə türki göftarı inşa oluna (24, s.18). Buradan belə bir nəticəyə gəlmək olar ki, yüz min beytə yaxın farsca şeiri olan (Nəsrabadi təzkirəsində onun farsca təxminən dörd min beytlik şeiri olduğunu söyləyir (20, s.34) şair ömrünün ixtiyar çağında vətən sevgisi, ana dilinə ehtiram nümayiş etdirərək türkcə divan tərtib etmişdir. Farsca böyük bir ədəbi irs sahibi Məhəmməd Tahir də türkcə şeirlərindən birində

türkdilli oxucuya müraciət etdiyini xüsusilə vurğulayır, «Sarmaşur, əlbəttə, ey türkizəbanan, sarmaşur» (11, v. 18a) deyir.

Vəhidin ana dilində yazdığı şeirlərini oxuyarkən onun geniş mütaliə dairəsinə malik olan intellektual bir şair olduğunu, sələflərinin əsərlərini dərindən bildiyini görürük. Şairin türkcə şeirlərində klassik sənətkarlardan ən çox öyrəndiyi, sənətinə pərəstiş etdiyi, heç şübhəsiz, dahi Füzulidir. Cəsarətlə deyə bilərik ki, Vəhid Qəzvini XVII əsrdə Füzuli ədəbi məktəbinin ən görkəmli nümayəndələrindəndir. Onun əlimizdə olan divanındakı şeirlərinin bir çoxu Füzuliyə nəzirədir. Bu nəzirələr içərisində qəzəl də, nəzm də, qitə də vardır.

Məlum olduğu kimi, XVII əsr türkdilli poeziyamızın, demək olar ki, bütün nümayəndələri istedadından, yaradıcılıq dəsti-xəttindən asılı olaraq Füzuli sənətindən özünəməxsus şəkildə bəhrələnmiş, dahi şairin şeir-sənət xəzinəsindən özlərinə gərək olanları götürmüşlər. Həmin dövr şairlərimizdən Qövsi Təbrizi, Saib Təbrizi, Vaiz Qəzvini, Məsihi, Zəfər, Mövci Əhəri, Mirzə Saleh Təbrizi, Məlik bəy Avcı və başqalarının ana dilində yazdıqları şeirlərində Füzuli yaradıcılığının böyük təsiri hiss olunur. Görkəmli ədəbiyyatşünas alim M.Quluzadə yazır ki, XVII əsr Azərbaycanda Füzuli ənənələrinin ən geniş yayıldığı, hərəkət və inkişafda olduğu bir dövrdür. İki dövrün ictimai-tarixi şəraitindəki oxşarlıqlar bu şairlərin Füzuli ədəbi irsindən belə geniş miqyasda öyrənmələrinin, ondan böyük məhəbbətlə bəhrələnmələrinin əsas səbəbi olmuşdur (14, s.359).

Bu dövr şairlərindən Qövsi böyük bir heyranlıqla Füzuli kəlamından ilhamlanmış, onun şeirlərinə cavab olaraq yazdığı qəzəllərinin bir çoxunun son beytini Füzulidən iqtibasla bitirmiş, həmin beytdə ustadının adını hörmətlə çəkmişdir. Mürtəzaqulu xan

Zəfər bəzən Füzulinin bir qəzəlinə bir neçə nəzirə yazmış, şeirində ondan böyük nüfuz sahibi tanımadığını bildirmişdir:

Ey Zəfər, tutgil qulaq bir dəm Füzuli şeirinə,
Ondan özgə heç şair şeir deməz, bu nəmət.

(24, s.45)

Həmin dövr şairlərindən təzkirələrdə Füzuli və Nəvai ardıcılı kimi xatırlanan Məlik bəy Avcı (25, s.133) qəzəllərindən birində özünün Nəvai və Füzuli səviyyəsində şair olmadığını deyərək, əslində şeirdə hansı sənətkarlara üstünlük verdiyini açıq şəkildə ifadə edir:

Nə Nəvai, nə Füzuli, nə Məlik, nə Adəməm,
Bəndə şahəm Məlik adlu, nə kənitü nə ləqəb.

(2,s.10)

Dediyimiz kimi, Vəhidin əlimizdə olan türkcə şeirləri içərisində Füzuliyə çoxsaylı nəzirlər vardır. Şairin türkcə divanının Berlin nüsxəsində Füzuli qəzəllərinə 88 cavab qeydə aldıq ki, bu da divanın həcmi miqyasında böyük rəqəmdir. V.Qəzvini bəzən böyük ustadının bir şeirinə bir neçə nəzirə yazmışdır. Vəhidin Füzuliyə nəzirələrindən biri «Görgəc» rədifli qəzəldir. Məlum olduğu kimi, bu rədifli şeirini Füzuli böyük özbək şairi Nəvaiyə cavab olaraq yazmışdı. Elə rədifin «Görgəc» şəklində işlədilməsi Nəvainin, cığataycanın (orta əsrlər özbək ədəbi dili) təsirindən xəbər verir. Lakin XVII əsrdə yaşamış şairlərimizdən Zəfər, Saib, Qövsi və Təsir Təbrizinin, o cümlədən, Vəhid Qəzvininin eyni rədifli şeirləri artıq Füzuliyə nəzirə olaraq yazılmışdır. Buna görə də bu nəzirələrdə cığatay dili elementləri yox dərəcəsindədir.

M.Füzulinin

Könlüm açılır zülfi-pərişanını görgəc,
Nitqim tutulur qönçeyi-xəndanını görgəc (4,s.99)

- beyti ilə başlanan qəzəli professor Əkrəm Cəfərin bölgüsünə görə,

həzəc bəhrinin «müstəzad həzəci» adlanan altıncı növü (məf'Ulü məfaİlü məfaİlü fəulün) ölçüsündədir (15, s.93). Təbii ki, həmin qəzələ yazılan nəzirələr də eyni bəhrdədir. Məlum olduğu kimi, nəzirələrdə tənzir olunan şeirin vəzni, qafiyəsi, rədifi gözlənilir (15, s.337). Bununla bərabər, nəzirə yazan nümunə götürdüyü əsərin mövzusuna da diqqətlə yanaşır, buradakı fikirləri digər varinatlarda ifadə edir, inkişaf etdirir.

Füzuli qəzəlində sevgilisinin gözəlliyindən, aşiq kimi özünün əhvalından danışır. Gözəlin canlı surətini təsvir edən şair hər beytdə müqayisələrdən istifadə edərək onun bir xüsusiyyətindən danışır. O, yarının qamətini şümşadla, dodaqlarını qönçə ilə müqayisə edir, məşuqəsinin bunlardan qat-qat üstün olması qənaətinə gəlir. Qəzəl bütövlükdə gözələ müraciətən yazılmışdır. Şairin bu formadan istifadə etməsini professor Mir Cəlal belə izah edir: «Füzulinin aşiqanə qəzəllərində, ümumiyyətlə gözəl vəsf olunur. Müəyyən bir məşuqə, aşiqin məhəbbət obyekti olmuş bir qız vəsf olunur. Ona görə də çox zaman bu vəsf aşiqin məşuqəyə xitabı şəklində verilir» (17, s.165). Şair burada məhəbbət alovunda yanan aşiqin halını da təsvir edir. Aşiq sevgilisinə baxdıqca gözlərindən qan saçılır, onun kipriklərinin oxunu gördükcə bağrı dəlinir. Eşqə həvəs edənlər aşiqin ağlar halını gördükdə həvəsdən düşürlər. Aşiqin hicran atəşini görən kafirlər bunu cəhənnəm oduna bənzədərək, qorxudan imana gəlirlər.

Aşiqin iztirab və həyəcanlarının yüksək poetik formada ifadə edildiyi bu qəzələ XVII yüzildə bir sıra cavablar yazılmışdır. Şeirə bu dövrdə yazılan bizə məlum ən iri həcmli nəzirə Vəhid Qəzviniyə məxsusdur. Vəhid qəzəlinin əvvəldən beş beytində sevgilisini seyr edən aşiqin pərişan əhvalından danışılır, sonrakı yeddi beytdə isə məşuqənin gözəlliyi təbiətlə, əfsanəvi obrazlarla müqayisə edilir.

Digər nəzirələrdə olduğu kimi, burada da mətlə beyti orijinalın birinci beytinə daha yaxındır:

Gözüm açlır qönçeyi-xəndanını görgəc,
Dilim tutulur çeşmi-süzəndanını görgəc (11,v.9b).

Vəhid şeirinin birinci misrasında «könlüm açılır» əvəzinə «gözüm açılır» yazıb, Füzulinin birinci misrasındakı «zülfi-pərişan» əvəzinə dahi şairin həmin beytinin ikinci misrasındakı «qönçeyi-xəndan» ifadəsini işlədib. Vəhidin «nitqim tutulur» əvəzinə «dilim tutulur» ifadəsini işlətdiyi ikinci misradakı «çeşmi-süxəndan» («danışan göz») ifadəsi istiarədir, poetikliyi ilə diqqəti cəlb edir. İkinci beytdə «Qəddim bükülür sərvi-xuramanını görgəc» (11, v.9b) -deyən Vəhid özünün bükülmüş qəddi ilə gözəlin sərvə bənzər boyunu müqayisə edərək təzad yaradır. Klassik ədəbiyyatda adətən aşiq bülbülə, məşuqə isə gülə bənzədilir. Vəhidin qəzəlində isə bülbül də, gül də gözəli görüb heyran olmuşlar:

Bülbül açılır gül kibi sən yanə gəzəndə,
Gül qönçə olur qönçeyi-peykanını görgəc.

(11, v.9b)

Fikrini daha poetik ifadə etmək istəyən şair beytin ikinci misrasında iltizam poetik fiqurundan istifadə edərək, «qönçə» sözünü iki dəfə işlətmişdir. Burada deyilir ki, gül gözəlin qönçeyi-peykanını (kirpiyini) görsə qönçələnər.

Son beytlərdən birində «surəti-Şirin» ifadəsindən istifadə edilir. Burada söhbət Şirinin özündən deyil, onun Fərhad tərəfindən Bisütun dağında nəqş edilmiş surətindən gedir. Füzuli qəzəllərindən birində «Könül hər surəti-Şirinə vermə, iç meyi-məni» (4.s.210) -deyərək cansız surətə könül verməməyi məsləhət gördüyü halda, Vəhid qəzəlində mübaliğə poetik fiqurundan istifadə edərək cansız surətin belə onun məşuqəsini görcək cana gəlib, bu gözəlin

yolunda can verəcəyini bəyan edir:

Hərçənd ki, canı yoxdu, surəti-Şirin,
Can verdi sənin canın üçün canını görgəc (11, v.9b).

Şair bir beytdə «can» sözünü dörd dəfə işlədərək cinas, «c» samitinin təkrarından alliterasiya yaradaraq («can» və «görgəc» sözlərində) fikrini daha poetik ifadə etməyə nail olmuşdur. İkinci misradakı «can» sözünün işləndiyi mənalara fikir verək: «can verdi»-özünü fəda etdi; «sənin canın üçün» - səndən ötrü; «canını görgəc» - üzünü, surətini, camalını görgəc.

Füzuliyə çoxsaylı nəzirə yazsa da, Vəhidə təqlidçi demək düzgün olmazdı, şairin anadilli poeziyamızın inkişafında özünəməxsus rol oynadığını deməliyik. Nəzirə forma eyniliyidir. Qeyd etdiyimiz kimi, XVII əsrdə yaşayıb-yaratmış bir sıra sənətkarlarımız böyük Füzuli yaradıcılığının sənətkarlıq xüsusiyyətələrindən öyrəndiklərini, onun şeir-sənət xəzinəsindən bəhrələndiklərini nümayiş etdirsələr də, bu şairlərdən hər birinin özünə məxsus dəsti-xətti vardır. Mirzağa Quluzadənin Qövsi haqqında dediklərini onun müasiri olan Vəhidə də aid etmək olar: «Füzuli lirikasının Qövsi yaradıcılığı üzərindəki xeyli qüvvətli təsirini Qövsinin zəif, epiqonçu şair olması ilə izah etmək səhvdir. Söz yoxdur ki, Füzuli yeni ədəbi məktəb yaratmış dahi sənətkardır. Qövsi isə onun ən istedadlı və görkəmli davamçılarından biridir» (14, s.356-357). Tədqiqatçılar Füzuliyə çoxsaylı nəzirələr yazmış Qövsinin istedadlı, orijinal bir sənətkar olduğunu bildirmişlər: «Şübhəsiz ki, Qövsi Füzulini təqlid etməmiş, əksinə, böyük şairin şeirlərindən klassik sənətin gözəl, mükəmməl nümunəsi kimi öyrənərək, öz yaradıcılıq simasını parlatmış, orijinal sənət inciləri yaratmışdır» (23, s.336).

Bu xüsusiyyətləri Vəhid Qəzviniyə də aid etmək olar. O da

Füzuli sənətindən öyrənərək kamil bir sənətkar kimi yetişmiş, XVII əsr tükrdilli poeziyamızın inkişafında müəyyən rol oynamışdır.

Vəhidin şeirlərində təbiət gözəlliklərinin təsvirinə, hikmətamiz fikirlərə, Peyğəmbərin, dövrün hökmdarının mədhinə də rast gələ bilərik. Lakin bütün bunlarla bərabər şairin yaradıcılığının əsas mövzusu, heç şübhəsiz, məhəbbət lirikasıdır. Füzuli kimi Vəhid də eşqi insanı kamilliyə çatdıran qüvvə hesab edir, «Kəmali-eşq hər divanəni sahibkəmal eylər» (11.v.18b) deyir. Şairə görə aşiq olub hicran acısı çəkməyən yaşadığı dövrün acılarından xəbərdar ola bilməz:

Hər kişi kim, çəkməmişdir canı hicran acısı,
Anlamaz, bilməz nədir dünyadə dövran acısı.

(11,v.29a)

Şair bəzən eşqi yolunda çəkdiyi əzablardan şikayət edərək, sevgilisinə üz tutub «Özünə düşmənlik eylər eyləyən ülfət sənə» (11, v.6b) - desə də, əksər şeirlərində hicran qəminin onun üçün canından da əziz olduğunu bildirir:

Dərdi, ya Rəb, can çıxan çağda canımdan çıxmasın,
Dadlı candan dadlıraqdır bu qəmi-hicran bənə.

(11, v.7a)

Vəhid şeirlərinin lirik qəhrəmanının kimliyində, mahiyyətində aşiqlik, məhəbbət vardır, nə qədər ki, o yaşayır, düşünmək, hiss etmək qabiliyyətinə malikdir, sevgilisinin surəti onun şüurundan silinməyəcəkdir. Şeirlərindən birində o bildirir ki, nə qədər bu sarayi-ariyətdə (müvəqqəti istifadə üçün verilmiş sarayda), yəni dünyada könül fanusində (fənərində) şüur şamı sönməmişdir, sevgisi xəyalında, xatirəsində yaşayacaqdır:

Bu sarayi-ariyətdə tirə olmaz xatirin,
Gər sönməz könlümün fanusində şəm'i-şüur

(11, v.12a)

Şair ona görə daim ah çəkir ki, yarının zülfünün təsvirini könlündə həkk etdirmişdir:

Etmişəm lövhi-dilə təsvri-zülfi-yarımı,
Bu səbəbdəndir müdam ahi-pərişan çəkdigim.

(11, v,23b)

Vəhidin şeirlərində Füzuli məntiqini görürük. Əgər Füzuli eşqinin şiddətini məşuqənin gözəlliyi ilə ölçərək «Hüsn nə miqdar olursa, eşq ol miqdar olur» (4,s.133)-deyirsə, Vəhid «Heç bənim eşqim sənin hüsnündən əksükraq degil» (11, v.5a)-deyərək məhəbbətinin böyüklüyü ilə fəxr etdiyini bildirir.

Məhəmməd Tahirin şeirlərindəki aşiq obrazı ilk növbədə eşqi yolunda fədakarlığı, hər bir əzaba hazır olması ilə diqqəti cəlb edir. Eşqində çəkdiyi cəfalar onu üzmək, bezdirmək əvəzinə daha da özünə cəlb edir. Şair gözəlin dodağı yada düşdükdə ürəyinin əriyib suya dönməsini bir nemət sayır:

Türfə nemətdir ki, dil yadi-ləbindən ab ola,
Dadmışam bu şəhdi-can, yaxşı əcaib dadı var.

(11, v.19a)

Çəkdiyi cəfalardan aşiq şaddır, sevgilisinə bağlı olsa da, onun qəlbi azaddır:

Şaddır aşiq ki, qəmgindir cəfayi-yardən,
Bənddədür öz qeyddən, əmma dili-azadı var (11, v.19a).

Vəhid şeirlərinin lirik qəhrəmanının ürəyi şüşə kimi kövrəkdir, lakin o hər cür əziyyətə davamlıdır, bu zahiri ziddiyyətə, təzada görə şair özünü «əcaib zad» adlandırır:

Dün Vəhidi gördüm, əlhəqq qabili-bidad imiş,
Daş canlı, şişə bağırlı əcaib zad imiş (11,v.22a).

Sevgisi yolunda möhnət çəkən aşiq bəzən zəifliyindən şikayət

edərək rəhm diləsə də, bu dərdlərin sahibinin zəif adam olmadığı bəllidir. Onun gücü çəkdiyi dərdin böyüklüyündə, tükənməz dözümündədir:

Dedim ki, gör zəifligim, rəhm qıl bənə,
Dedi ki, kuhi-dərd çəkən natəvan degil (11, v.23a).

Bu yenilməz, dözümlü, fədakar aşiqin sevən qəlbi haqqında dedikləri də onun öz obrazını tamamlamaqdadır. Şair qapısının dağ, bacasının heyran göz olduğu qəribə bir mənzərə yaradır, bu mənim ürəyimdir – deyib sevgilisini oraya dəvət edir:

Dağdır qapısıvü dideyi-heyran bacası,
Gəl dilim xanəsinə, bacaludur, qapıludur (11,v.13a).

Dahi Füzulinin əsərlərində lirik qəhrəmanın kədərinin möhtəşəmliyini şərtləndirən cəhətlərdən biri də onun sevgilisinin əlçatmazlığı, vüsalın qeyri-mümkünlüyüdür. Vəhid müasiri Qövsi kimi, vüsalı mümkün sayır, lakin, belə hesab edir ki, bununla eşq dərdinə əlac elmək olmaz. «Müyəssər, gər olursa vəsli-canan, həsrətim artar» (11,v.13b), «Hər kim səni verirsə bənə, mehriban degil» (11,v.23a) deyən şairə görə vüsal aşiqin həsrətini daha da artırır. Çünki aşiq vüsal dəmi bundan sonra labüd olaraq gələcək hicran qəmini yaşayacağını bilir, buna görə də əvvəlcədən iztirab çəkir, vüsal vədi etməməsi üçün məşuqəsinin dodaqlarına sur-divar çəkmək istəyir, «İstərəm vədeyi-vəslə ləbindən sur çəkəm» (11, v.23b)-deyir. Vüsal da hicran kimi aşiqi əzablara düçar edir:

Aşiqi-biçarədir hər vəslü hicrindən səmər,
Tər basar vəslindəvü hicrində çeşmim yer kəsər (11,v.14a).

Lakin çəkdiyi bütün iztirablara baxmayaraq, Vəhid şeilərinin lirik qəhrəmanı tutduğu yoldan çəkilmək fikrində deyil, o, bu yolda dinindən, imanından da keçməyə hazır olduğunu bildirərək «Dinü imandan keçmək gərək təriqi-eşqdə» (11,23b)-deyir.

V.Qəzvininin bütün şeirlərində təsəvvüfdən uzaq gerçək sevgidən bəhs edildiyini iddia edə bilmərik. Şairin bəzi şeirlərində heç bir təsəvvüf donu geyindirilməmiş real, dünyəvi məhəbbətin tərənnümünü görürürk. Ona görə, əgər sevgilisi qucağındadırsa, elə qucağı cənnətin bir bucağıdır:

Sorarsan gər xəbər cənnət bu cani-qeyd fərqindən,
Qucaqda olsa gə canan, qucaq cənnət bucağıdur(11,v.15b).

Eşqində çəkdiyi qəm şairə çox əzizdir, o bu pərişanlığına böyük önəm verir, gecə-gündüz onün üstündə əsir:

Bu pərişanlıq ki, zülfündən bənə olmuş nəsib,
Titrərəm üstündə sübhü şam cəm'iyyət kibi (11,v.28b).

Eşq elə bir dərddir ki, dərmanı elə eşqin özüdür, buna görə də şair məşuqəsinə üz tutaraq «Eşq dərmandır bənə, cana, əgər sənsən təbib» (11, 6b).-deyir.

Vəhid şeirlərində eşqində düşdüyü halın, psixoloji durumunun təsvirinə xüsusi diqqət vermişdir. Eşqinin şiddətindən dili tutulan aşiq «Şövqdən tutmaz dilim, gahi və gahi tutular» (11, v.6a)-deyir. Yarının surəti heç vaxt onun gözlərindən getmir, o hara baxırsa, sevgilisini görür:

Əksi-ruyi-yar çün çeşmi-pəridən getmədi,
Baxıram hər yanə, timsali müsəvvərdür bənə (11, v.6b).

Aşiqin vəziyyəti qeyri-müəyyəndir, o nə qəmgin, nə şaddır: «Türfə halı var dili-zarım, nə qəmgirdür, nə şad» (11, v.20a).

Şair vəziyyətini dəqiq şərh etməkdə acizliyini etiraf edərək yazır:

Nə ölü, nə diri, nə məsti-layəqəl, nə hüşyarəm,
Nə qəmginəm, nə xəndan yarsız, bilməm nə halimdir (11,v.13b).

Nalədən onun bədəni elə titrəyir ki, yuxu quşu gecələr gözünə qona bilmir, yəni o yuxusunu itirmişdir:

Yuxu quşu gecələr aşiyani-didəmə qonmaz,

Nəsimi-nalədən cismim nihani bəs ki, lərzandır (11, v.13b).

Sevgilisinin gözündən düşmüş aşiq elə zəifləmişdir ki, nəqqaşın onu görüb rəsmini çəkməsi müşkül məsələyə çevrilmişdir:

Düşmüşəm gözündən sənin, rəngim deyər əhvalımı,

Zə'fdən nəqqaş həm müşkül çəkər timsalımı (11,30a).

Lakin bu halsızlığı, eşqi yolunda yanıb kül olması onun taqətini artırır, Səməndər quşu yanıb kül olduqdan sonra yenidən dirilən kimi, aşiq də aramını, qərarını itirdikdən sonra daha da güclənir:

Dəxi oddan işimiz hər nə yandı, oldu xakistər,

Tükəndi çünki aramım, qərarım, taqətim artar (11,v.13b).

Vəhid şeirlərinin xaratker cəhətlərindən biri səmimiyyətdir. «Məgər» rədifli qəzəlində sevgisinin gücünü sübut etmək üçün o, eyni səmimiyyətlə yarının xəyalına, cansız əşyalara müraciət edir. Bədii sual və təcahüli-arif poetik fiqurlarından daha çox istifadə edilən bu şeirin bütün beytləri sual cümləsi şəklində qurulmuşdur:

Dağdar könlümü, ey bədxu, gülüstan eylədin,

Gülmədin, açılmadın, bu evdə mehmansan məgər? (11,v.17a).

Şair sevgilisinə üz tuturaq yaralı, qəmli könlünü onun eşqindən gülüstana çevirdiyini bildirir. Könlünü bir ev sayan aşiq buranın sahibi olan məşuqəsinin üzünün gülmədiyindən, ona qarşı laqeyd olduğundan şikayət edir: Məgər o bu evdə qonaqdır?

Şeirin digər beytində şair gecə-gündüz rahatlıq, yuxu bilməyən (qarşısında duran hər bir şeyi əks etdirdiyinə görə) güzgüyə müraciət edir. Bəlkə o da gözəlin hüsnünə heyran olmuşdur:

Gecəli-gündüzlü bir dəm xabü rahət görmədin,

Ol pəri hüsnünə ey ayinə, heyransan məgər? (11, v.17a).

Mücərrəd və konkret anlayışları ustalıqla bir araya gətirə bilməsi Məhəmməd Tahirin dilini daha poetik, daha romantik etmişdir. O heç kimə bənzəmyən sevgilisini «tale gəlişli, ruh gedişli nigarım»

(11, v27b) adlandırır. Nigarının gəlişi şairin həyatını dəyişdirə bilər, buna görə də o tale gəlişlidir. Gedişi ilə o, aşiqinin ruhunu özü ilə aparır, buna görə isə o, ruh gedişlidir. Şair sevgilisinin yadına düşməsini, o gözəlin xəyalının dağlardan yol tapıb könlünə girməsi kimi təsvir edir, «Dağlardan yol tapıb girdi xəyalı könlümə» (11, v.29a)-deyir.

Vəhid çox güclü təxəyyülə malik şairdir. O, şeirlərində təbiət hadisələrindən, cansız əşyalardan mahir bir rəssam kimi istifadə etməyi, onları məqsədinə uyğun olaraq, fikrini oxucuya daha əyani çağdırmaq üçün mənalandırmağı çox gözəl bacarır:

Səyheyi-əflak bəndən yarimə bir namədir,
Dil dəvatü xun mədadü dudi ahum xamədir (11.v.14b).

Göy təbəqəsini kağız, ürəyini mürəkkəbqabı, qanını karandaş, ahının tüstüsünü qələm kimi istifadə edərək eşqini yarına çatdırmaq qüdrətinə malik olduğunu söyləyən şair xəyal gücü, sözünün poetikliyi ilə diqqəti cəlb edir.

Şeirlərindən birində şair deyir ki, ürəyinin parçaları göylərə qalxaraq, hər biri ulduz olmuşdur: axır ki, sevgilisi onun yüz parça olmuş ürəyini görəcəkdir:

Görünür axır sənə ləxti-dili-sədparəmiz,
Çün üruc oldu gögə, hər biri bir ulduz olur (11, v.14b).

Burada hüsni-təlil poetik fiqurundan məharətlə istifadə edilmişdir.

XVI əsrin sonları – XVII əsrin əvvəllərində farsdilli poeziyada poetik üslubun dəyişməsi prosesi gedirdi. «Hind üslubu» («səbki-hindi») adlanan üslub öncə İranda, sonra Hindistan, Əfqanıstan, Orta Asiya və Türkiyədə yayılmağa başladı. Farsdilli poeziyada meydana çıxmış, türkdilli şeirdə də əksini tapmış bu yenilik «sadəcə formanın yeniləşməsindən ibarət deyildi, savadlı şəhər təbəqələri

mühitində yeni ideya-bədii istiqamətlərin nəticəsi idi. O, yüksək həyati həqiqətini və klassik dövr poeziyasının daxili dramatizmini itirmiş ənənəvi saray mədhiyyə poeziyasına cavab kimi meydana çıxdı. Onun meydana çıxması poeziyanın intellektuallaşdırılması təmayülü ilə, ortodoksal müsəlman, sünni və şiə ehkamlarından imtina ilə bağlı idi (10,s385). Bu üslubun nümayəndələri qəzəlin tematik diapazonunu genişləndirmiş, onu mürəkkəb fəlsəfi, ictimai, əxlaqi məsələlərin ifadəçisinə çevirmişdilər. Hər cür məhdudiyyətə, fanatizm və təəssübə yad olan bu şairlərin dünyagörüşündə o dövr üçün qəribə görünə bilən genişlik, dini, məzhəbi, etinik və sosial fərqlərə biganəlik müşahidə olunurdu ki, bunu onların özləri «vos'əte-məşrəb» («xarakter genişliyi») adlandırmışlar. Yeni üslubun nümayəndələri «tanış olmayan, yeni, qeyri-adi motiv, obraz» kimi başa düşülməli olan «məniyi-biganə»ni təbliğ edirdilər (16, s.82). «Hind üslubu» şairləri mücərrəd anlayışları konkretləşdirmək məqsədi ilə klassik poetikanın təmsil fiqurundan geniş istifadə edirdilər. Beytin birinci misrasında müəyyən bir fikir söylənilir, ikinci misrada isə onu izah edən misal, real həyatdan bir fakt verilir.

Filologiya elmləri namizədi Məsiağa Məhəmmədi «Saib Təbrizi və farsdilli poeziyada «hind üslubu» adlı monoqrafiyasında bu üslubun məşhur nümayəndələri sırasında Saiblə bərabər Vəhid Qəzvininin də adını çəkir (16,s .55). Türkcə divanını vərəqlədikcə, Vəhidin ana dilində yazdığı şeirlərində də «hind üslubu»nun xüsusiyyətlərini görürük.

Yeni üslubun digər nümayəndələri kimi Məhəmməd Tahir də təmsil poetik fiqurundan istifadə etdiyi bir sıra beytlərdə ictimai məsələlərə toxunur, ibrətamiz fikirlər söyləyir. Onun şeirlərindən birində maddi cəhətdən imkanlı, var-dövlətli şəxslə qəlbi geniş

insan pul kisəsi ilə ürəyin timsalında müqayisə edilir:

Kisəvü dil-ikisi şişeyi-saətdür,

Ki, biri xali olan çağda birisi doludur (11.v.13a).

Pul kisəsi ilə ürək şişeyi-saətin-qum saatının iki tərəfinə bənzədilir, bir tərəf dolu olarsa, digəri boş olur. Yəni ürəyi dolu olanın pul kisəsi, pul kisəsi dolu olanın isə ürəyi boşdur. Şairin vizual obrazın köməyi ilə göstərdiyi bu qanunauyğunluq dövrün mənzərəsini, cəmiyyətdəki ədalətsizliyi parlaq şəkildə əks etdirir.

Başqa bir yerdə Vəhid dövrün kamala çatmış, ziyalı, savadlı şəxslərinin acınacaqlı maddi vəziyyətindən söz açır:

Afəti çoxdur kəmalın, etmə təhsili-kəmal,

Bal arısı tək evi olmaz ki, viran olmasın (11,v.26a).

Beytin birinci misrasında kamallı olmağın ziyanlı, bəlalı bir şey olmasından danışılır. Burada da təmsil poetik fiqurundan istifadə edən müəllif ikinci misrada bal arısını nümunə gətirir: İnsanlara fayda verən bal arısının evi-şanısı viran-dəlik-deşik olduğu kimi, kamil şəxsin də bəlası çoxdur.

XVII əsrdə bir sıra Azərbaycan ziyalılarının, o cümlədən, şairlərin müxtəlif səbəblərdən vətənini tərk edərək xarici ölkələrə mühacirət etmələri barədə məlumatımız vardır. Onların içərisində Məsihi, Saib Təbrizi kimi sonralar vətənə qayıdanları da, Rəhməti Təbrizi, Mirzə Sadiq Ordubadi kimi xaricdə vəfat edənləri də olmuşdur. Vəhid şeirlərindən birində vətənindən ayrı düşənlər barədə yazır:

Naçar edər calayi-vətən cövri-çərxdən,

Divani-şeirdə biri çün intixab olur (11, v.17a).

Vətənindən ayrı düşənlər çarəsizlikdən şikayət edirlər. Onlar bilməlidirlər ki, şairlər toplusu-divandan seçib götürülmüş bir şeir kimidirlər, yəni vətənin say-seçmə övladlarıdırlar.

Şair mənsəb, var-dövlət hərisliyini təmsil sözişlətmə sənətindən

istifadə etməklə məharətlə ifşa edir. O, əfsər (tac, yüksək vəzifə) sahibi olanları məclisdə yanan şama bənzədir. Onlar yandıqlarını dərk edə-edə bu dərdə əlac edilməsini, vəziyyətin dəyişməsini istəmirlər:

Cəhan bəzmində bənzər şəm'i-bəzmə sahibi-əfsər,
Yanar, əmma deyər bu dərdə pamal olmasun, ya Rəb (11, v.7a).

Dövrünün bir sıra digər mütərəqqi dünyagörüşlü şairləri kimi Məhəmməd Tahirin də bəzi fanatik din xadimlərinə münasibəti mənfidir:

Yaman görməz gözü, əlbəttə, hər kim zahidi görməz,
Yaman hərgiz eşitməz kim ki, vaizdən xəbər sormaz (11,v.21b).

V.Qəzvininin şeilərində hikmətamiz-didaktik fikirlər də az deyil. Şair şeirlərində insanları həyatdakı çətinliklərə təslim olmamağa, nəfsinə sahib olmağa, gözüaçıqlığa, bədbinliyə qapılmamağa çağırır. Bir şeirində Vəhid deyir ki, əgər bir qəza baş versə, etiqadlı adamın bundan üz çevirməyi küfrdür. Çünki nə gəlirsə, Tanrıdan gəlir:

Qəzadan yüz çevirmək küfrdür, gər etiqadın var,
Peyəmbər kibi həqdür, çün gələn işlər Xudadəndür (11, v.16a).

Burada əsla qəzavü qədərə təslimçilik təbliğ olunmur. Hər hansı bir qəzanın Yaradan tərəfindən göndərildiyini qəbul edərək təmkinlə vəziyyətdən çıxmaq məsləhət görülür.

Həyatda baş verən hadisələr şairi kədərləndirsə də, bəzən onun insanlara inamını azaltsa da, o, bədbinliyə qapılmır, insanları da nikbinliyə çağırır. Çünki insanın həyatdan arzuladığını ancaq Tanrı verə bilər: «Hər mətləbim ki, xatirim istər, Xuda verir» (11,v.14a). Bədbin adam isə hara baxsa, yamanlıq görər: «Bədbin olan kişi özü daim yəman görər» (11,v.20a).

Filologiya elmləri doktoru Araz Dadaşzadə «Toy, bayramdır bu dünyanın əzabı, Əqli olan ona gətirər tabı» (28, s.161)-deyən XVIII əsr Azərbaycan şairi Molla Pənah Vaqifin yaradıcılığındakı nikbinlik barədə yazır: «Vaqifin nikbinliyindən danışarkən, bizcə, həlledici cəhət onun şəxsiyyəti, fərdi dünyabaxışıdır… Vaqifin nikbinliyi və bu nikbinliyin «Həyatın sonu puçdur» - deyə nəşələnməyə çağıran hedonizm və epikürçülükdən seçilməsi, həyatı necə varsa, bütün dərdi-bəlası ilə bir «toy-bayram» kimi qəbul etməsi mənalı və ibrətamizdir. Bu nikbinliyin əsas məziyyətlərindən biri məhz odur ki, şair heç də yaşayışın araya çıxardığı minlərlə maneə, dram və faciədən təcrid olunmaq istəmir. Onları həyatın acı, lakin zəruri reallığı kimi qəbul edir. Vaqif anlayır ki, həyat hamar yol deyildir (3, s.121-122).

Vaqifdən bir əsr öncə Vəhid də həyatın acı və xoş günlərini, lütfünü və qəhrini eyni cür qəbul etməyi məsləhət görmüşdür. Çünki bunların hər ikisi ömürdən sayılır:

Ömrümüzdən sayılır ruzi-səfidü şami-tar,
Lütfilə qəhri-ikisi həm bərabərdür bənə (11,v.6b).

Vaqif yaradıcılığındakı nikbinlik barədə fikrini inkişaf etdirən A.Dadaşzadə yazır: «Onun əqidəsi belədir ki, ən ağır məşəqqət belə ölümdən, axirət dünya xülyasından yaxşıdır» (3,s.122). Belə çıxır ki, nikbinlik bu dünyada yaşanılan günlərin qədrini bilərək, onlardan feyz ola bilməkdir. Fikrimizcə, görkəmli tədqiqatçının bu izahı orta əsr adamının, ümumiyyətlə, sovetləşməyə qədərki əksər adamların dünyagörüşünü tam əks etdirmir. Vəhidin də, Vaqifin də, digər klassiklərimizin də nikbinliyi yalnız Tanrıya, onun mərhəmətinə əsaslana bilərdi. Şair şeirlərində bu dünyanın gözəlliklərini cənnətdən üstün tutduğunu söyləyə bilərdi. Lakin bu o demək deyil ki, o Yaradanı, əbədi, baqi dünyanı yadından çıxarmışdır.

Vəhidin müasiri Mürtəzaqulu xan Zəfərin şeirlərini oxuduqca onun səmimi, tərcümeyi-halının müxtəlif məqamlarını cəsarətlə əsərlərinə gətirən bir şair olduğunu görürük. Şair ömrünün ixtiyar çağında yazdığı bir sıra şeirlərində həyatda çəkdiyi əziyyətlərdən, haqsız yerə incidildiyindən danışsa da, hər bir qəmin sonunda sevincin gəldiyini söyləyir, oxucunu bədbinləşməməyə, nikbin olmağa çağırır. Zəfər şeirində uzun ömür, maddi imkan, gözəllərin məhəbbətini bu dünyada ona verdiyinə görə Yaradanına şükr edir, o biri dünyada da Allahın mərhəmətinə ümid etdiyini bidirir:

Şad ol Zəfər, könüldə dəxi üqdə qalmadı,
İki cəhanda ömür verir cavidan mənə (24, s.23).

Bu fani dünyadakı həyatına görə tanrıya şükr edən şairlərimizin nikbinliyinin eyni zamanda baqi dünyada Allahın mərhəmətinə ümidlə bağlı olması, fikrimizcə, heç kimdə şübhə doğurmamışdır. Sovet dövründə çap etdirdiyi monoqrafiyasında A.Dadaşzadə bunları yaza bilməzdi.

V.Qəzvininin şeirlərində həyatın ən müxtəlif məqamlarına dair nəsihətamiz fikirlərə rast gəlirik. Şair nəfsinə təslim olan adamı aciz adlandırır. Ona görə əsl qalib o şəxsdir ki, nəfsinə qalib gələ bilmişdir:

Rəiyyət olmuşam nəfsi-xəbisə, olmuşam aciz,
Əgər olsam müsəllət nəfsimə, sultanlığım vardır (11, v.12b).

Beytlərindən birində şair insanları başqalarına qarşı biganə olmamağa çağırır. İkinci beytdə təmsil poetik fiqurundan istifadə edərək belə bir misal gətirir: Əgər hərflər bir-birindən ayrı olsalar, birləşməsələr, onlardan söz yaranmaz:

Bu tənha gərduni biganə gəzmə, qalma biganə,
Yapışmaz bir-birə ta həfrlər, hərgiz kəlam olmaz (11,v.21b).

«Hind üslubu»nun ən görkəmli nümayəndələrindən biri olan

Saib Təbrizinin yaradıcılığında da buna bənzər fikrə rast gələ bilərik. Saib insanları bir-birinə yaxın olmağa, bir-birinə kömək etməyə çağırır, onlara göydə uçan quşlardan deyil, nar dənələrindən örnək götürməyi məsləhət görür:

Gög fəzası nə məqami-pərü bal açmaqdır,
Daneyi-nar kimi bir-birimizə qısılın (21, s.164).

Gördüyümüz kimi, poeziyada yeni üslubun nümayəndəsi olan hər iki şair həyata qeyri-adi baxışları ilə seçilirlər, onlar real gerçəklikdə, ətrafda baş verən hadisələrdə, ən müxtəlif həyati faktlarda bir məna tapır, onları ictimai, fəlsəfi fikirləri ilə əlaqələndirirlər ki, bu da «hind üslubu»nun xarakter cəhətlərindəndir.

Vəhid həddindən artıq sərvət toplamağı tənqid edərək «Daima xatir pərişandur qəni maldar» (11, v.17a) deyir, var-dövlət sahibi olanların üzünün gülmədiyini bildirir. O, oxucusuna məsləhət görür ki, ömrünün xoş və asan keçməsini istəyirsə, dünyanın könül daraldan işlərindən kənar gəzsin:

Ömrünü gər istər isən kim, xoşu asan keçə,
Özünü bu təngnayi-dəhrdən bir yanə tut (11, v.9a).

Şair insanları gözüaçıq olmağa, fürsəti əldən verməməyə, düşmənə arxa çevirməməyə çağırır:

Mərd əldən fürsətin, əlbəttə, verməz düşmənə,
Tiğ tək ağzı olan arxa çevirməz düşmənə (11, v.26a).

Məhəmməd Tahirin şeir sənəti haqqında fikirləri də diqqətəlayiqdir. «Hind üslubu» nümayəndəsi kimi məniyi-biganəyə, tanış olmayan, yeni, oxucuya qəribə, qeyri-adi görünə bilən motiv, obraza xüsusi fikir verən şair bunun şeirdə tətbiqi zamanı qarşıya çıxan çətinliklərdən danışır:

Məniyi-biganə tarac eyləmişdi əqlimi,

Bir-birilən ləfzü məni olmamış məhrəm hənuz (11, v.21b).

Məniyi-biganədən istifadə etmək Vəhidin əqlini çoxdandır ki, məşğul edir, lakin sözlə məna arasında tam uyğunluq tapmadan, onları bir-birinə məhrəm etmədən bunu həyata keçirmək olmaz.

Məhəmməd Tahirə görə yazılan şeirlər arasında fərq qoymaq lazımdır, şeirdən şeirə böyük fərq vardır:

Fərq şeir arasidə vardur zəmin ta asiman,
Bir şeirə biri dəgməz, biridir şeri-şüar (11,v.17a).

Dəyərsiz şeirlə dillərdə əzbər olmağa layiq olan «şeir-şüar»ı fərləndirə bilmək şairin də, oxucuların qarşısında duran ən vacib məsələdir.

Vəhidə görə şairin dəyəri onda yüksək olar ki, dərdını, kədərini əsərində ifadə edə bilsin, buradakı məna formanın məhdud çərçivəsinə sığa bilsin:

Bir nişandır ələmimdən ki, düşübdür dilimə,
Şeir bəhri ki, sığa cədvəli-təngi-qələmə (11.v.26b).

V.Qəzvini öz yaradıcılığını yüksək dəyərləndirərək şeirlərini şirinlikdə halva ilə müqayisə edir, əsərlərini oxuyan bədxahların ona paxıllıq etdiklərini, «heyrət toruna» düşdüklərini bildirir:

Kəlamım şəhdini görən güman etmiş bəni həlva,
Çü gördü, düşdü dami-heyrətə bədxah nişanımidan (11,v.24b).

Dediyimiz kimi, Vəhid türkcə divanında şeirlərini janrlara görə ayrı-ayrı düzməmiş, bütün şeirləri janrından asılı olmayaraq əlifba sırası ilə sıralamışdır. Divana salınmış yüzdən artıq təkbeyt özünün mövzu zənginliyi, bədiiliyi ilə diqqəti cəlb edir. Bunların içərisində məhəbbət lirikası nümunələrinə, ictimai məzmunlu parçalara, eləcə də nəsihətamiz şeirlərə rast gələ bilərik. Təkbeytlərdə şairin maraqlı poetik tapıntılarının, məhdud imkanlı, kiçik janrda poetik lövhələr yarada bilməsinin, dilin imkanlarından məharətlə istifadə etməsinin

şahidi oluruq:

Rəhm et, bənə, heyranın olum, getmə nəzərdən,
Göz işığısan, göz işığı gözdə gərəkdir (11,v.20a).

Təkbeytlərdən birində Vəhid yalnız fellərin köməyi ilə sevgilisinin əlindən əzab çəkən aşiqin tarixçəsini oxucuya böyük ustalıqla çatdırır:

Gəldi, gördü, gözlədi, etdi, dolandırdı bəni,
Əglədi, əgdi, əritdi, bükdü, yandırdı bəni (11,v.9b).

Gördüyümüz kimi, bu şeirlərin dili də çox sadədir.

Məhəmməd Tahir şeirlərindəki təbiət təsvirləri ilə də diqqəti cəlb edir. Xüsusilə bahar fəslinə həsr etdiyi şeirlərində o, təşbeh, bənzətmə və mübaliğələrin köməyi ilə oxucunun gözləri önündə təbiət gözəlliklərinin mənzərəsini yaradır. «Novbahar oldu, genə açdı yüzündən gül niqab» (11,v.8a) misrası ilə başlanan şeirində şair göy qurşağını dəf musiqi alətinin çənbərinə-kənarlarına, şimşəyi göydə oynayan mələklərə bənzədir:

Çənbəri-dəf kibi oldu cilvəgər qövsü qüzeh,
Oynadı xeyli pəri tək gögdə hər yandan şəhab (11,v.8a).

«Oynar» rədifli şeirində şair baharın gəlişilə cavan və qocaların özü-özündən oynadığını, bütün təbiətin rəqs etdiyini göstərir, suların şırıltı ilə axmasını onların da əl çalıb oynaması kimi mənalandırır:

Gül üzlü növbaharın kəndi-kəndindən şeyxü şab oynar,
Oxur gülşəndə sular, əl çalar mövcü hübab oynar (11,v.18a).

V.Qəzvini şeirlərində canlı danışıq dili elementlərindən, atalar sözləri və məsəllərdən həvəslə isfifadə etmişdir. Şair onu incidən sevgilisinə incə yumorla «saçı kəsilmiş» (11,v.21b) deyir, «İt-itilən dalaşur, qurdu görər, arxalaşur» (11,v.17a), «Qarın doyuran aşı kor tanur» (11,v.20b) kimi atalar sözlərini yerində və məharətlə işlədir.

Yumor hissi Vəhidin bir çox şeirlərində özünü göstərir. Bahar

vaxtı bağı badəsiz seyr etməyi o, tövbəli adamın meyxanəyə girməsi ilə müqayisə edir:

Böylə gül fəslində seyri-bağə getmək badəsiz,
Öylədir kim, tövbəli adəm girə meyxanəyə (11,v.26a).

Vəhid fikrini oxucuya daha poetik çatdırmaq, daha yaddaqalan etmək üçün ana dilindəki sözlərin çoxmənalılığından uğurla istifadə etmişdir. «Qəm çəkmə bu kədəri ürəyindən çıxar» demək istəyən şair dilimizdə «çək» feilinin bir çox mənalarda işləndiyindən məharətlə bəhrələnir:

Çəkmə bu dərdi könüldən, bu yegani çək çıxar,
Mey çəkəndə özgəsi çün sən çəkərsən intizar (11,v.17a).

Bu beytdə dərd çəkmə, bu qəmi ürəyindən çəkib çıxar, başqası mey çəkəndə (yəni keyf çəkəndə), sən intizar çəkirsən–fikrini poetik şəkildə ifadə edən Vəhid türk dilini çox gözəl bildiyini nümayiş etdirmişdir.

Şair şeirlərindəki ekspressivliyi, emosionallığı artırmaq üçün beyt və misralarında sinonim sözlərdən, təkrirlərdən də istifadə edibdir. Sinonim sözlərdən ibarət olan bir misra – «Salasaldur, qaçaqaçdur, kəsakəsdür, tamaşadur» (11,v.19b) yaranmış qarışıq vəziyyəti çox gözəl ifadə edir. Vəhid təkrirlərin köməyi ilə əsərlərinin təsir gücünü məharət artıra bilir:

Öylə sərməstəm ki, hicranında bilməm şəb nədür,
Ay nədür, ulduz nədür, əncüm nədür, kövkəb nədür (11,v.13a).

Digər misal:

Açıl, açıl, açıl, açıl, ta ki, səhər açıla (11,v.27a).

Və yaxud:

Kuyində Vəhidin dili-zarı necə oldu,
Ey can, sölə, ey can, sölə, ey can, sölə billah (11,v.27a).

Şair şeirlərində alliterasiyaya – eyni cinsli samitlərin təkrarı

vasitəsilə sözünün təsirinin artırılmasına xüsusi fikir vermişdir. «C» samitinin təkrarına bir misal:

Hərçənd ki, cana, yoxdu surəti-şirin,
Can verdi sənin canın üçün canını görgəc (11,v.9b).

Məhəmməd Tahirin şeirlərində poetik fiqurların əksəriyyətindən məharətlə istifadə edildiyini görürük. Məqlub sənətinə-bir hərf ilə fərqlənən sözlərin eyni misra (bəzən də beyt) daxilində müxtəlif şəkildə yer taparaq, bununla da ahəngdarlıq, musiqililik yaratmasına misal:

Yaşurma xalını bəndən, yaşursan həddən aşurma (11,v.25b).
Çünki dündən çıxdı gül, dindən gərək bülbül çıxa (11,v.27a).

Təzad poetik fiqurundan istifadəyə misal:

Könlümü daim yəman ol yaxşı baxışlı tutar (11,v.14a).

Bu və ya digər predmetin, hadisənin əlamətinin başqasına köçürülməsi demək olan istiarəyə misal:

Səf çəkib vəslində əşkim mən' edər nəzzarəni,
Bu uşaqlar göz yolun mümkün degildir azələr (11,v.13a).

Göz yaşları aşiqə sevgilisini görməyə imkan vermir. Lakin bu uşaqların (yəni gözlərin) yolunu azması, gözəlin yerini çaşdırması mümkün deyil. Uşaqların yolunu yaxşı tanıması xüsusiyyəti gözlərə aid edilmiş, bununla da istiarə yaradılmışdır.

V.Qəzvinin şeirlərində hüsni-təlil poetik fiquru əsasında yazılmış bir sıra beytlərə rast gəlirik. Məlum olduğu kimi burada obyektin təsvirində bir əlamət və keyfiyyət başqa bir əlamət və keyfiyyətin meydana gəlməsinə səbəb olur. Nəticədə ikiqat təsvir özünü göstərir. Misal:

Necə kim bikar edər şəmü çırağı nuri-mehr,
Gün əbəsdir xaneyi-yarımdavü bikar sübh (11,v.10b).

Aşiqin sevgilisi bir günəşdir. Gün şam və çırağı əhəmiyyətsiz

etdiyi kimi, yarın evində sübhün gəlişinin, günün doğmasının da bir önəmi yoxdur.

Vəhid müəyyən bir hadisəyə işarə etmək demək olan təlmih sənətindən də uğurla istifadə edibdir. Məsələn, «Görmüşəm zülmati-zülfün, abi-heyvan istərəm» (11,v.23b) – deyərkən o qaranlıq dünyada İskəndərlə Xızrın dirilik suyu axtarmaları rəvayətinə işarə etmişdir.

XVII əsr Azərbaycan anadilli poeziyasının görkəmli nümayəndələrindən Qövsi Təbrizi, Mürtəzaqulu xan Zəfər, Məczub Təbrizi, Məlik bəy Avcı kimi Vəhid Qəzvini də türkcə şeirlər toplusu-divan müəllifi olmuşdur. Bu divana daxil edilmiş şeirlər onun türkdilli poeziyamızın inkişafındakı xidmətlərini dəyərləndirməyə imkan verir.

## Ə D Ə B İ Y Y A T


1. **Azər Lütfəli bəy.** Atəşkədə. Tehran, 1337.

2.**Caferoğlu A.** XVII-inci asırda Azeri şairi Melik bey Avcı. İstanbul: Bürhaneddin matbaası, 1933.

3. **Dadaşzadə Araz.** XVIII əsr Azərbaycan lirikası. Bakı: «Elm», 1980.

4.**Füzuli Məhəmməd.** Əsərləri. I cild. Bakı: Azərbaycan SSR EA Nəşriyyatı, 1958.

5. **Gəncəyi Turxan.** İsfahandakı Səfəvi sarayında türk dilinin mövqeyi. «Bakı-Təbriz» jurnalı. 2006, №4.

6. **Heinz Wilhelm.** Persisiche Handschriften. Teil 1. Wiesbaden: Frans Steiner, 1968.

7. **Hüseyni M.Ə.** Ədəbiyyat tariximizdən səhifələr. Bakı: Nurlan, 2004.

**8. İpekten Haluk.** Eski türk edebiyatı. Nazm şekilleri ve aruz. İstanbul: Dergah yayınları, 1999.

**9. İslam ansiklopedisi.** 2. cilt. İstanbul: Milli Eğitim Basımevi, 1970.

**10. История всемирной литературы.** T.IV.M.: Наука, 1987.

**11. Qəzvini Vəhid.** Divan. Əlyazma (Fotosurət). Berlin Dövlət Kitabxanası. Şifr: Ms.orient. Fol. 3314.

**12. Qəzvini Vəhid.** Divan. Əlyazma (Fotosurət). Təbriz Milli Kitabxanası, №2647.

**13. Qəzvini Vəhid.** Hesab. Əlyazma. Şifr: M-9 (IV). v.88b-124b. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu.

**14. Quluzadə Mirzağa.** Füzulinin lirikası. Bakı: Azərbaycan SSR EA Nəşriyyatı, 1965.

**15. Məhəmməd Füzuli (elmi-tənqidi məqalələr).** Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, 1958.

**16. Məhəmmədi Məsiağa.** Saib Təbrizi və farsdilli poeziyada «hind üslubu». Bakı: «Elm», 1994.

**17. Mir Cəlal.** Füzuli sənətkarlığı. Bakı: Nurlan, 2007.

**18. Muin Məhəmməd.** Fərhənge-farsi. C.6.Tehran, 1378.

**19. Mümtaz Salman.** Azərbaycan ədəbiyyatının qaynaqları. Bakı: Yazıçı, 1986.

**20. Nəsrabadi Məhəmməd Tahir.** Təzkireyi-Nəsrabadi. C.1. Tehran, 1378.

**21. XVII əsr Azəpbaycan lirikası (Antologiya).** Bakı: Nurlan, 2008.

**22. Raxmani A.A.** Proizvedenie Muxammed-Taxira Vaxida «Abbasname» kak istoriçeskiy istoçnik. İzvestiə Akademii Nauk Azerbaydjanskoy SSR. Seriə istorii, filosofii i prava. 1974, №2.

**23. Səfərli Ə., Yusifov X.** Qədim və orta əsrlər Azərbaycan

ədəbiyyatı. Bakı: ADU nəşri, 1982.
**24. Şamlu Mürtəzaqulu xan.** Divan. Bakı: Nurlan, 2006.
**25. Şamlu Vəliqulu bəy.** Qisəsül-xaqani. C. 2. Tehran: İrşadi-islami, 1374.
**26. Təbrizi Qövsi.** Divan. Bakı: Nurlan, 2005.
**27. Tərbiyət Məhəmmədəli.** Danişməndani-Azərbaycan. Bakı: Azərnəşr, 1987.
**28. Vaqif Molla Pənah.** Əsərləri. Bakı: Yazıçı, 1983.

**PAŞA KƏRİMOV,**
*filologiya elmləri namizədi*

## D İ V A N

### MƏSNƏVİ

Şərabi-nab bağİ-dilgüşadır,
Tərəbi-gülzarda abü həvadır.

İçər mey hər kimin ki, canı var, can
Ki, meydən qeyri yoxdur abi-heyvan.

Gəl, ey saqi ki, sən can parəsisən,
Əgər şahı sevərsən, keçmə məndən.

Sənin tək seyddən ox daxi keçməz
Ki, çün keçdi, gözün ondan götürməz.

Şərabın vəsfini pünhanü peyda,

Edər hər zərrə nəzmü nəsr inşa.

Görübdür ta şərabi-pürtəkali,
Təxəllüs eyləyibdir gün hilali.

Çəmən bu xətt olan çağlarda heydir,
Əbəs durma, təəmmül qılma, heydir.

Ver, ey saqi, demə mən mərdi-cəngəm,
Xəta çıxmaz əlimdən, dəsti-təngəm.

Əgər tutmaz əlim, incinmə bəndən,
Meyi görgəc qolum oynar yerindən.

Gül üzlü cami-mey ta bəzmə gəlməz,
Yerə hərgiz sürahi boynun əgməz.

Məni bir sağər ilən damə saldı,
Verib bir qırmızı, könlümü aldı.

Bu atəş şol qədər rövşən göründü
Ki, şəm'i-bəzm şərmindən ərindi.

Fələk gər almaz isə cami bizdən,
Girovdar oldu ömri-rəftəmizdən.

Bizə Hatəm ədasın sən sevdirdin,
Gər aldın sağəri boş, dolu verdin.

Şərabın şərbdən ta bəzmə gəldi,
Ərindi gül, gülab andan çəkildi.

Ələmdən kəşti qurtardı canı,
Xudaya, saxla sən bu naxudanı.

Bəli, meydir həkimi-hikmət ayin,
Kimini şad edər, kimini qəmgin.

Açıldı şisəvü sağər tutuldu,
Doluxdu cam, qəhqəh şişə güldü.

Dolu ver, söylə ta sahib zamansan,
Xümə girsə gər Fəlatuni-zamansan.

Görübsən dili dutmaz məsti axər,
Demək istərdi çox verəydi çaxər.

İçər mey meygüsari-eyşpişə,
Güzü qış, yazü yay, yəni həmişə.

Xüsusən kim, bahari-eyşməcmil,
Səadət bağı içrə tutsa mənzil.

Səadət bağı əlhəqq biqərindir,
Behişti-ərseyi-ruyi-zəmindir.

Güli-pirayeyi-hüsni-səfadır,
Cəhan qəlbinə xaki-kimiyadır.

Düşübdür himməti əzbəski, ali,
Nəsimi-xüldə əğməz baş nihali.

Bəsi ali düşübdür qədrü şani,
Zəmini səbzədəndir asimani.

Dolublur fezydən hər gül ayağı,
Kəlidi-qifli-dildir gül budağı.

Görübdür şahdan guya güli yüz
Ki, neylufər kibi gündən boyar göz.

Edər hər rəngi-gül bir firqəti faş,
Qızıl güldür aralıqda qızılbaş.

Çu düşmüş rəngi hindu kibi tirə,
Bənəfşə bağlamış başına cirə.

Gülmaqla səmərdən ta bəridir,
Tüfəngin gizləmiş yeniçəridir.

Düşübdür cəfəri əlhəq yeganə,
Geyüb tubi əgərçi rumiyanə.

Çü girdin bağə, bari hər yerə bax,
Firəngi börkli neylufərə bax.

Müşabeh dirsəgi yanmış çırağə,

Zi cürmilən səkilmişdir budağə.

Xiyabaninə ta baxdım nihani,
Apardı könlümü bu rismani.

Gül odundan məgər qurmuş gülüstan
Ki, açmışdır xiyabani giriban.

Xiyabanlar tamami cədvəlidir,
Çəmən quşi sərasər məxməlidir.

Tamaşayi-mey etmiş qəmdən azad,
İki yandan çəkən səf sərvü şümşad.

Çinari bəski düşmüş şuxü niku,
Çəkir dil çeşməsindən rişəsi su.

Küdurət qalmadı könlündə baqi,
Kimə kim, seyri-saqi oldu saqi.

Olubdur mənzur niku mənzərimdən,
Yetürmiş başı gögə o cövhərindən.

Bu dərgahə özüni bəndə çağlar
Ki, bin əl köksümə qulluqda bağlar.

Qızıl gilas oxşar çeşmi-zağə,
Ərik ağacı bənzər çilçırağə.

Əritməyə gübarisi küncündə
Ki, var püstani püstanbənd içində.

Edər qurdun gözün əngur təsvir,
Quzu quyruğudur çeşmində əncir.

Görüb ta almadan sibi-zənəxdan,
Təmə qılmış ənari-abi-dəndan.

Hədisi-püsteyi-xəndanə yetmiş,
Təmə dişini abrizə çəkmiş.

Geyibdir gül libasi intixabi,
Surahisini doldurmuş gülabi.

Şükufə yar Yafətdən dəsti-təqdir,
Nigəh seydinə gurmuş dami-rəngir.

İmarət yolda gilasi əndərqut
Ki, çərxinə qoymuş iki yaqut.

Bəsiti-xakdən kim asimandır,
Kəvakiblər şəqaiqdən əyandır.

Demə lalə ki, aylar çıxdı günlər,
Açar güni bu açılmış dügünlər.

Tutub hindu kibi gülşəndə məskən,
Çəküb ayinə səndəl elçi susən.

Məkanlardan olubdur intixabi,
Müdəvvər ayı bir mahtabı.

Olub çün məşuq o nurə gövhər,
Bu mahə halə bir nəhri-müdəvvər.

Çü olmuşdur Süleyman ona memar,
Süleymaniyədir özü nəhri-zinar.

Dünya əhlinə etmiş hüsnini faş,
Çəkilmiş göz kibi nurani bir qaş.

Səfası vəsfi həddən birundur,
Bu qaşın sonu gövhərdən füzundur.

Gözün açıb, olub gülzarə heyran,
Məhəccərdür anın dövründə məkan.

Səfayi-təb'dən gör ki, xəcildir,
Kəməndü hiddətin ərbabi-dildir.

Çü gəldin bu məkanə işrət ilə,
Kəməndi-vəhdəti gör vəhdət ilə.

Əgərçi bu məkandan keçmək olmaz,
Vəli hüsni-imarət cəzbi qoymaz.

Cəhanə irtifai göstərib san,

Oturmuş təxt üzrə bir Süleyman.

Şərabi-hüsndən könlü olub şad,
Sipəndəlik oynar bir pərizad.

Sütunlar kim nəzərdə cilvəgərdir,
Durub şəhbərində şəhzadələrdir.

Edər imanı qarət abü rəngi,
Müsəlmandur özi, bərgi firəngi.

Olubdur şiveyi-hüsninə məftun,
Gəzər talar tək dövrinə gərdun.

Qoyubdur bir-birin dalusına pa,
Gögə çıxmaq məgər istər Məsiha?

Görünür asimandan şanı artıq,
Yaraşır ana əlhəq xudnümalıq.

Ona qarşudur bir imarət
Ki, ondan kəsb edər kövkəb səadət.

Durubdur xidmətində gahü bigah,
Bəli, qapuçisiz olmaz şəhənşah.

Tutubdur ovci-aydan qədrü təxti
Ki, oldur pəhləvan paytəxti.

Səbahü şəb bu şuxi-kamilül-zat,
Qoyub dəryaçədən damanə mir'at.

Əcəb dəryaçə kim, dəryayi-ümman,
Edər daim anın rəşkindən əfğan.

Cəhanə ğülğüli-şöhrət buyurdi,
Sədası Dəclədən ördək oxurdu.

Nəmudi-bey'i qəmfərsavü mətlub,
Şikəsti-fövci-düşmən kibi mərğub.

Yüzdür əl, dil ona hər kim ki, versə
Ki, aparar əlinə hər nə girsə.

Nəzərlərdə füzun oldu nəmudu,
Verildi şah hökmi-zindərudu.

Ona bağlandı bir səddi-humayun
Ki, rəşkdən büküldü püşti-gərdun.

Bu sədd üstündə bir pül etdi təmir
Ki, yoxdur vəsfin etməkcə təqrir.

Sərapa lütfi-əndamü səfadır,
Nəzərdə bir nigari-dilrübadır.

Odur bir aşiqi-bitabü-bidil,
İmarət xidmətində qilmış bil.

Şəhənşahi-cəhan dolub sərası,
Səadət oxunun fərrux hüması.

Cəhanə sayə etmək muradı,
İki talar iki bamdan fitadı.

Olaydı munca gər çərx irtifai,
Yerə yetməzdi mərkəznin şüayi.

Nəzərdə asiman vüs'ət ahəng,
Ana pirahəni-fanus tək təng.

Olubdur çərx vəqtindən pədidar,
Necə kim, əbri-gərdun, ovci-kuhsar.

Böyüklükdən rəva bilməz müxtəl,
İki görməz fələk tək onu övhəl.

Demə vəsfi həmi tərifə sığmaz,
Böyüklükdən söz andən dışra çıxmaz.

Ayağı altidə pərvər tənidə,
Necə kim, səvə şahini qaynağidə.

Demə kim, bu imarət sayə saldı,
Götürgəc anı, bir nuri qaraldı.

Görübdür sərvi tək özünü mövzun,

Olubdur məddahi-şahi-humayun.

Özüni ta mövzun görübdür,
Təxəllüs baği firdövsi ötübdür.

Cəhanda taqdır bu şuxi-dilcu,
Edüb seyqəl hisarın cümlə güzgu.

Bu məni surəti andan görüşmüş,
Təmaşanı nəmudə tağ görmüş.

Hisari bəski düşmüşdür səfalı,
İtaət çərxə etməz bu cəlalı.

Binası səng, libası cümlə xara,
Vəli diba kibi bəzmü müsəffa.

Fələk öz vəsfinə qoymaz əsasın,
Mühəyya etməmiş dərzi libasın.

Deyər hər kim ki, gördi bu binanı
Ki, hökmi-həzrəti-sahibqərani.

Yerə gərduni endərdi, götürdi,
Götürdi, bari hər çe yetürdi.

Olub heyran huşə göstərdi didar,
Bu mənidən gülü xurşid səyyar.

Fələkdir çün anı görsən kəmahi
Ki, vardır kövkəbi-xurşidü mahi.

Anı mir'at edüb könlündə təsvir,
Çəkildi heybətindən surəti-şir.

Gəl, ey saqi ki, açıldı gülüstan,
Genə oldu gül üzlü bağ xəndan.

Ver, ey saqi, bizə cam dəmadəm
Ki, gül kimi açılsın üqdeyi-qəm.

Bahar olmuş, rəbi ayında mey ver,
Doluxma sağəri-mey kimi, hey ver.

Fələk deyir şiə şahının mütii
Ki, həcc ayında görüşmüş rəbii.

Bu ayında çün Ömər getmiş cəhimə,
Şəfa ver badeyi-dil təb'i-səqimə.

Bu ayında çün qəmindir can nasib,
Özünə qıl meyi həcc kimi vacib.

Əlində zərqiran, ey mərdi-həqbini,
Ömər ləini eylə ona kabini.

Meyi-gülrəngdən bu ayda keçmə,
Bu suyi əmnsiz, əlbəttə, içmə.

Tapar məqsudini bu ayda raci,
Bu məl'uni-ləindir leyk, hacı.

Çəküb mey həccə etmə səyü puyə
Ki, həcc gəlmiş ayağilə qapuyə.

Gəl, ey zahid, meylə günlərdə cam iç,
Əgər meydən qaçaq olsan, müdam iç.

Bu qırmızıdan et taət xəzinə,
Ömər peyrovlarının korluğunə.

Bu məlun riqqəti olmuş gər rəvayət,
Rəbi ayında pəndin al hidayət.

Əgər varsan ğulami-şahü şiə,
Çəkə-çəkə mey çəkdir rəbiə.

Ərəb qafillərindən bir yeganə,
Demiş bir nüktə əlhəq arifanə

Ki, bu bayram əgər mübhəm olaydı,
Bir bayram sarayı kəm olaydı.

Olaydı gər bu ay ibhamdan bədr,
Bizə bu gün olurdu leylətül-qədr.

Bu iki ayda əldən qoyma cami,

İki gözün ikisin tut girami.

Zülali-badə birər, yoxsa ahəng,
Sənə bəs bu iki adilgüahəng.

Açıqdır ta gözün, bikar durma,
Hübabi-mey kibi meydən götürmə.

Əgərçi sağəri-mey ayə bənzər,
Dolmaqdan bu ayın nuru artar.

Gül üzlü cami-mey ta bəzmə gəlmiş,
Əritmiş gül, gülab andan çəkilmış.

Xüsusən kim, bahari-xürrəmibar,
Edüb ruyi-zəmini ruyi-dildar.

Qaçar məhcub rəngi kibi lalə,
Dolu çək qırmızı meydən piyalə.

Bu gülgun sudan et bu eyddə nuş,
Özün rəngini qıl çöhrə nuş.

Bu çaqdır sağəri-gülrəng çağı,
Bu al atə minüb, tut ol qaçağı.

Gəl andən getməmiş algil muradi,
Uçar quşdur, könüldə qanadi.

Görən göz görməmiş, ta gördügü var,
Çiçək üzlü bu zibalıqda dildar.

Süleyman bəzmdədir, bu çeşmi-bəddur
Ki, saymaz zərrəyi-xurşidi hər mur.

Degildür bağ vəsflər sərvi-rəna,
Durub şəhzadələr qulluqda bərpa.

Demə güldür bu şux mənzər,
Qanadlar bir-birə çatmış pərilər.

Behişt olmuş gülüstanda müsəvvər,
Çəməndir cənnətü mey abi-kövsər.

Düşübdür gəlməyindən gül qəfanə,
Əlini qönçələr sərmiş cinanə.

Bu gündə əndəlibin günü gündür
Ki, səhni-bağdə toydur, dügündür.

İlahi, ta nigindən var ola nam,
Ola ta şahla tacü təxti ram.

Ola ruzü şəb dövran əlində,
Süleymani kibi gərdan əlində.

Ola fərmaninin təhtində aləm,
Özi təxt üzrə misli-Hatəm.

* * *

## Q Ə S İ D Ə L Ə R

### 1

Xosrovi-xosrovan ruyi-zəmini
Ki, qəza kibi hökmidür cari.

Çeşmi-lütf ilə padşahlarun,
İntixab eyləmiş onu Bari.

Qalmamışdır xərabi-xaneyi-dil,
Ta olubdur zəmanə memari.

Dud tək tirəruzdur zalim,
Gərmdir bəs ki, ədl bazari.

Eylədi dəbdəvər Məsiha tək,
Nəzəri-lütf bilə talari.

Güzgüdən didəyə qoyub eynək,
Göz açıb gördü qüdrəti-yari.

Necə talar dideyi-bəddür,
Xaneyi-çeşmi-pak tək ari.

Demə olmuş hisari taqnüma,
Oldu talarə məhv divari.

Güzgü oldu sütunu sərtapa,
Məhvdür şahə çeşmi-bidari.

Yer ayaq üstə qulluğa durmuş,
Qafil olmaz gedər süpehr sari.

Çün bu ayinəxanə oldu təmam,
Verdi tovfiq həzrəti-Bari.

Salıb əda başın dedim tarix
Ki, göz açmış təvilə talari.

* * *

**2**

Cüneydabad, vəh nə zibasən,
Aftabi-süpehri-minasən.

Var tüluin ğürub edəndə müdam,
Gizlənür vəqtlərdə peydasən.

Gözünə şişədən qoyub eynək,
Məhvsən yarə, türfə minasən.

Könlümün razisən məgər ki, müdam,
Şişə içrə nihanü peydasən.

Ey ayağın gül, üzarın şəbih,
Türfə məşuq, xoş sərapasən.

Köhnə, növcəvan xətayindür,
Misri-mənidə sən Züleyxasən.

Qəm üqabına düşənlər üçün,
Bir pürfərxari-müsəffasən.

Bas ayaq başimə, oturma belə,
Heyfdir, sən əsiri-minasən.

Mehr tək həm fitadə, həm ali,
Bəndəfərmanü karfərmasən.

Yandırırsan könüldə atəşi-şövq,
Sən gümanımda piri-tərsasən.

Sənə vermiş yerini Əflatun,
Sən xüm içrə həkimi-danasən.

Tibdə qaimməqami-Calinus,
Sani əsneyn İbni Sinasən.

Gizləməz kimsə razını səndən,

Gərçi sən pərdəsuzü rüsvasən.

Qanlu yaşın gülə-gülə tökülür,
Eşqə razivü naşəkibasən.

Gün doğar, hər yerə yetər ayağın,
Kəfi-beyza, füruği-Musasən.

Gər degilsən Məsih vəqtindən,
Məhdi-mina içində guyasən.

Xəlqi-aləm qanı sənə qaynar,
Sən məgər yari-şöləsimasən?

Aşiqin könlü eşqlə barışur,
Sən əgər təndə karfərmasən.

Qılğılın əmrdir həriflərə
Ki, deyən razı bimüdarasən.

Olmaya yaxşı gər yaman dilim,
Sanasən yari-biməhabasən.

Açılan yerdə söz çıxar səngdən,
Nədimsən, əcəb müəmmasən.

Güli-rəna, aştiyü nəza,
Abi-heyvan, tiği-bürrasən.

Şərmgin ruyi-marə bənzərsən,
Şöleyi-cani-naşəkibasən.

Dinü iman, sufiyi-meykəş,
Düşməni-can, şeyxü mollasən.

Dil verür atəşin qədrü ahcə,
Dindirür zahidi, tamaşasən.

Faş edərsən çəhar-eybimizi,
Gerçək ayineyi-müsəffasən.

Gah pərvaneyi-nicati-cəhan,
Gah həm şəm'i-məclisarasən.

Ey nəzərdən pəri kibi pünhan,
Gah bulunmaz nişanı ənqasən.

Sən pəri, şahi-din Süleymandur,
Əmr edən bəzmlərdə peydasən.

Şah-Abbasi-saniyü adil
Ki, deyər çərxsən, mənasən.

Ey şəhənşahi bişəbih misal,
Gəh fələk, bargahi-valasən,

Görməmiş çərx bir Quran ayəsi.
Sən kibi, sən zəmanəarasən.

Bizlərin fikri vəsfinə yetməz,
Bəski sən fikri-fərdin əlasən.

Rəngini pəst edüb yumağ olmaz,
Sənə, Cəmşid, ya ki Darasən.

Mehri şəm'ə şəbih etməkdir,
Gər deyəm mehri-aləmarasən.

Hansı dərya göhər saçar şəbü ruz
Ki, deyəm kəflərini dəryasən.

Verilir arzu kamından,
Dəmi-canpərvəri-Məsihasən.

Səni hər kim görər, gözi açılur,
Sən kəlidi-dü çeşmi-binasən.

Şəstdən navəkin şişə çıxanda dəyməz,
Daşasan şişə, ya ki, xarasən.

Könlün ayineyi-Sikəndərdir,
Mubəmu kainatə binasən.

Görüşür ruzigar dəftərini,
Anda sən şahbeyti-qurrasən.

Xəsm canında o diyari-seyyid tək,

Aftabi-sipehri-Məsihasən.

Sən kibi bərgüzidə az gördük,
Bəhri-imkanda dürri-yektasən.

Xosrovi-mülk, zahirü batin.
Məclisəfruz ali-Tahasən.

Tapdı mə'ni yeganəlik səndən,
Şah isminə sən müsəmmasən.

Bəzm həngaməsində abi-həyat,
Rəzm vəqtində tiği-bürrasən.

Çeşmi-aləmsən, ey xidivi-cəhan,
Cani-şirin pirü bürnasən.

Can, var baqiyi-müsəvvərsən,
Çeşmsən, leyk çeşmi-quyasən.

Sənədir bənd xəlqi-ruyi-zəmin,
Bəndeyi-xasi-Həqqi-Taalasən.

Görsən göz yəmanini hərgiz,
Deyilür ta ki, çeşmi-binasən.

* * *

**3**

Cüneyabad, yarə bənzərsən,
Laleyi-novbaharə bənzərsən.

Gah varsan, gəl piyada kimi,
Gah Sami-süvarə bənzərsən.

Takdən təzə çıxdığın çağlar
Kudəki-neysəvarə bənzərsən.

Xümdə xəlvətnişin olan dəmdə,
Piri-hikmətşüarə bənzərsən.

Yari-canı əgərçi dari-nemətsən,
Xəsmi-bizinharə bənzərsən.

Gərçi mə'şuqi-əhli-məclissən,
Aşiqi-biqərarə bənzərsən.

Zahidin tərkini edən çağlar,
Şeyxi-pərhizkarə bənzərsən.

Saqiyə gözlərin düşən dəmdə,
Məsti-biixtiyarə bənzərsən.

Xümrə tək pəhləvani-dövransən,
Gərçi mehri-nigarə bənzərsən.

Sənə olmuş əsir pirü cəvan,
Tirreyi-tabdarə bənzərsən.

Qırmızı üzlü saf batinsən,
Sufiyi-tacdarə bənzərsən.

Necə kim, istərüz müqərrəbsən.
Müxlisi-şəhriyarə bənzərsən.

Şahi-İrani-Səfi ki, lüğfündən,
Kövkəbi-tacdarə bənzərsən.

Ol şəhənşah ana ki, çərx deyər,
Dəhr üçün sən baharə bənzərsən.

Çəkər olsan çü düşmənə şəmşir,
Sahibi-zülfiqarə bənzərsən.

Əbrəşi-dövlətə çıxan çağlar,
Şahi-Düldülsəvarə bənzərsən.

Padşahlar başı məkanındur,
Gövhəri-şahvarə bənzərsən.

Sözünü eşidən həyat tapar,
İsayi-ruzigarə bənzərsən.

Mayeyi-fəxri-xaki-rahindür,

Demənəm iftixarə bənzərsən.

Hər ki, sayən görər, hümayə deyər,
Gəzmə dövlətlü a'rə bənzərsən.

Biədəblik edüb deyə bilməm,
Sənə Sami-süvarə bənzərsən.

Çeşmi-ümmidi aləmin sənədür,
Rəhməti-kirdikarə bənzərsən.

Gözümüz duruxdu nuri-ruyindən,
Mehri-aləmmədarə bənzərsən.

Gün kibi necə çün aça ələmin,
Şiri-düşmənşikarə bənzərsən.

Bərqi-bey'in bir əldən çağlar,
Əbri-fəsli-baharə bənzərsən.

Şahi-sahibgiran xətayindür,
Rüstəmi-tacdarə bənzərsən.

Olasan ta ki var zəmanə ki, sənin,
Şahidin yadigarə bənzərsən.

* * *

## QƏZƏL, QİTƏ, NƏZM VƏ TƏKBEYTLƏR

Nemәti-didar verdi didәmә nurü ziya,
Bu yanar atәşdәn alışdı kaseyi-kәşküli-gәda.

Öz işidәn bir gün Fәrhad axır içmәdi,
Qazıdı hәr dağı … ibtida ta intәha.

Kar guya olduğumdan Bisütunda qalmadı,
Surәti-Fәrhadü Mәcnun surәti tәk binәva.

Payeyi-tarın rәsәn, ey bivәfa, olmuş bülәnd,
Aşdı gәrdun, vәli birun sana yetmәz dua.

Özüni bilmәm, vәli duşda sığmaz könlümün,
Bәski, bәrgi-qönçeyi-gül tәk edәr nәşvü nüma.

Yar tәk könlüm dәxi hәrgiz bәni yad eylәmәz,
Şiveyi-biganә yar ilә olmuş aşina.

Necә kim dәrs oxur mәktәbdә tifli-mәktәbi,
Lәxti-dil hәr birisi şәbnәmdә eylәr bir sәda.

Gözünә bir gәz baxarsam, yar gerü baxmaz bana,
Dedin vadidi, olmaz kim ki, oldu dәstpa.

Bica әgәr içәrsә qanım qanlı güzarın,
İncinmә, başına dönüm, gәr desәm çәra.

Bir ömrdür ki, keçdi bәnә, görmәdim sәni,

Vardır əgər qəza, sən … sən əda.

* * *

Görmədi səndən gözüm yüz, olmadı heyran sənə,
Əvvəlü axirin kibi olmuş böylə sərgərdan sənə.

Dərdinə dərman tolubdur, gərçi dərmani-mərgdür,
Məhşəri-küyində çün tapşurmaq olmaz can sənə.

Görə bilməz zə'fdən ayineyi-əksindən nişan,
Böylə müşkil iş görünmüşdür nədən asan sənə.

Çıxdı guya təqibi-hüsnün Süleyman təxtinə
Kim, könül quşları cana-ayaqdan fərman sənə.

Özini aşiqmisən hərgah olursan cilvəgər,
Sənə qurban olmuş, gər olmuş fərman sənə.

Keçdi can çəkmək kibi hər bir nəfəs çəkmək bizə,
Netdi, yarəb, ey Xızır, bu ömri-cavidan sənə?

Mecəri-hüsnüni göstərcək cəmalindən niqab,
Həm tamaşadur bizə, həm fal bu heyran sənə.

Zə'fdən mu kibi olmaq ol kəmər,
Xəl'əti-puşidəsini etməmiş ehsan sənə.

Gərçi şirinsən özün, can rahətidir sözlərin,

Özü nəsbə verür həm zə'f, həm dərman sənə.

Çox doluxmuş qanlı yaşından dili-dərya, Vəhid,
Basar ol qanlı əlini neçə mərcan sənə.

* * *

Vəsmə çəkmiş əhdi-hüsnündə bənə tiği-sitəm,
Əl çıxarmış qanımın tökmağinə rəngi-həna.

Ləli-ləbin bəhasinə çün eyləməz vəfa,
Bu rəngkərdə qaşlarına nəqdi-can fəda.

Şirin dodağlı, sözləri acı, qulam sana,
Biganəsən çün mənə, çeşmindir aşina.

Ol dəm bəni diriltdi çeşminin, nigahin,
Cana yetürdi cinan üçün məni bu qara.

Zahid ki, aşiq olmadıvü badə içmədi,
Bilməz əgər deyəm ki, nədir abü badü hava.

* * *

Bən deməm cana ki, bu miskin nigəhbandur sənə,
Göz budur yüzünə heyran, özü qurbandur sənə.

Artırır hüsnüni, mən' etmə bəni-Fərhadun,

Ta onun  hər bir pəri zülfi-pərişandur sənə.

Heç bənim eşqim  sənün hüsnündən əksükraq degül,
Çünki heyrandır bənə hər kim ki, heyrandır sənə.

İltifatından bənə xoşraq gəlür ruxi-rəqib,
Çün bana azad etmək lütfü ehsandur sənə.

Suyi çini libasi-zə'fd dövründən təhi,
Görünür müşkil bənə, hərçənd asandır sənə.

Sənə baxan yardan göz götürən yoxdur, Vəhid,
Neyləməm kuyində kim, axır nigəhbandır sənə.

* * *

Canan ki, səndən özgə degildir hicab ona,
Olur nəzarayi-lütfi-bədəndən niqab ona.

Vardur hübabdən bədəni xoşvaşraq,
Zinhar, ta ki, durmayasan intixab ona.

Çün istədi ki, ola siyəhməst gözləri,
Bağrım kəbab verdivü əşkim sərab ona.

Dildən bəni salanda çün əhvalımı ələ,
Ey kuhi-qəm, sor nə verirsən cəvab ona.

Bəhri-fənayə qutəvərdir natəvan könül,

Gər kəştisini dəydürür ol hübab ona.

Əzbəs zəifdür sümügi rəngi bəd sınar,
Aşiq əgər giran ola bir ləhzə cəvab ona.

Düşnami çünki baisi-ehyayi-xəlqdür,
Gər bir günah edə, yazılur səvab ona.

* * *

Mümkün olmazdı ki, artıqlıq edə düşmən bənə,
Gecələr gər nalədən bəs olmaz idim bən bənə.

Sal nəzərdən gözünə hər nə gəlürsə bidirəng,
Dilsiz ağız belə dedi bunu bir verin bənə.

Neylərəm dünyavü üqbanı ki, əldən vermənəm,
Neylərəm cana, məgər kafi degilsən sən bənə?

Gərdişi-dövranı gör, gər dırnağ ilə kor görər,
Hər … mə'ni taridir, rövşən bənə.

Handa sərsər, handa qılman, handadur hurü pəri,
Ola bilməzsən günəş bir dideyi-rövşən bənə.

Turi-dildən didəyə gahi parıldar bir şüa,
Canibül-seyr olubdur vadiyi-imən bənə.

Ol ki, keçmiş candan bimehr canandan sənə,

Keçməmiş eşqində hərgiz dinü imandan bənə.

Deyə bilməm çün gətirdi nükhətini mahi-sübh
Kim nə keçdi ol səri-zülfi-pərişandan bənə.

Nameyi-bərcahi kəbutər gətirir, hər saət gəlür,
Ləxti-dil peydərpey ol çahi-zənəxdandan bənə.

* * *

Lütf əgər etməyə can yari-cəfakarə fəda,
Eşqdən yarə əgər olsa dilim yarə fəda.

Ləxt-ləxt olsa əgər qönçeyi-dil cövründən,
Rahi-kuyində olan hər biri bir xarə fəda.

Qəlbimi gər əridib, tutsa qubar dilimi,
Ayıra bir-biridən ol büti-əyyarə fəda.

Gər giriban kibi sədparə olubdur yürəgin,
Sə'y qıl bir yarə, şayəd ola bir yarə fəda.

Qətrə-qətrə tökülən xuni-dilim cismimdən,
Ərəqi-çöhrə ol dilbəri-xunxarə fəda.

Dərd çəkmiş cigəri-rişü dili pürxunim,
Səhhət qulu olan nərgisi-bimarə fəda.

* * *

Kəbeyi-ümmidsən, qurban edərlər can sənə,
Eybi var hər kim ki, canın eyləməz qurban sənə.

Ey könül, fərdayə salma, vermə əldən fürsəti,
Başinə çevril ki, düşmüş növbəti-dövran sənə.

Şişeyi-səhbayə bax, seyr et dərilmiş gülləri,
Məclis olmuş, ey gül, həm bağü həm bustan sənə.

Çöhrəsin görgəc olub heyran o bundan xarını,
Yarə qurban etmədin,  gör neylədi nisyan sənə.

Böylə rüsva, ey könül, Məcnun görərsə gər səni,
Gül kibi başındakı dağın edər ehsan sənə.

Yarə əhd etdün ki, bən qəm keyfdən ayılmanam,
Pey çəkübsən bəs güli-peymanə peyman sənə.

Gər tamaşa istərsən, çək camalından niqab,
Xəlq olur heyran bənə, ol dəm çün bən heyran sənə.

Tazəki işlərindən sayılıbsan, ey Vəhid,
Kim baxar həsrət gözülən qeysərü xaqan sənə.

Ey könül, bir ağacıyıq cilvəgərsən didəmə,
Bağlamış əzbəski, hər kim tazə bir böhtan sənə.

* * *

Min gözi var idi mumun şəm'i-məclis olmamış,
Cümləsi meysuz idi rəvanə vəslindən cüda.

Bu ədanın xətti xətadən pərişan qalmış bizə,
Bu həman yoldur ki, getmiş həzrəti-Adəm ona.

Bar kim, vermiş inanın bu dili-bitab ona,
Qürbəyə bənzər ki, olmuş müştəri qəssab ona.

Hər kimin dərdinə dərman ol nigarın ağzıdır,
Bən kibi bigüfəgü dərman olur nayab ona.

Gər qəriqi-bəhr olur hər kim ki, düşmüş binəsib,
Gəzdirən peymanəsini nuş verür girdab ona.

Çün olur pərvanə sərgəştə şəm'indən cüda,
Başə küldur dutsa pərtövi-məhtab ona.

Cuyi-gövhər abini görməz çü hey giryansız,
Ab vermiş riştə hər kim ki, düşmüş tab ona.

Həqnəvisi-saliki-rəh çün ğəni oldu azad,
Karvani-quldur cəm'iyyəti-əsbab ona.

Zahidin həqqində, saqi, zaye etmə sə'yini,
Vermə, zalim, ta qəsəmdardur şərabi-nab ona.

* * *

Edərəm bəski pəsəndidə düşübdür rəvişin,
Ayənd karımı ol şiveyi-rəftarə fəda.

Yox gərəkməz ola ağzında çü yoxdur ağzın,
Yox deme gər sevəm sarü yoxum yarə fəda.

Hər nə varın ola çeşmim kibi gər ola əziz,
Rüxü zülfinə əgər ağ, əgər qarə fəda.

Qiymətü qədrim ola ol məh qəvarə səbil,
Türreyi-hurü pəri ol büti-tərrarə fəda.

Yolunda gəh güli-firdövsü əgər reyhandur,
Gedər ikən iş payimə bir xarə fəda.

Deyərəm hər nə bənə Tarı veribdir kəmü biş,
Yarımın türrəsidən cümləsi hər tarə fəda.

* * *

Raziyəm, yoxdur münasib şikveyi-gərdun bənə,
Çün verür sağər bənə yetdükdə bəhri-xun bənə.

Daməni-səhrayə gər çulqaşdı, bica etmədi,
Qaldı üryan, çünki verdi kisvətin Məcnun bənə.

Hər diyarım çəngi-tari kibi eylər bir səda,
Bəzmi-əhli-dərd içrə oldu bu qanun bənə.

Odlu rəftarımdan aramımı bim edüb bəndən qaçar,
Cadlardəq mövcə dərya gəlür hamun bənə.

Şəm tək hər qətreyi-əşkim etdi rövşən bir çıraq,
Eylədi həmrahlıq bu taleyi-varun bənə.

Ol cəfacu yay əbrusi kibi açılmamış,
Nameyi-piçidədən zahir olur məzmun bənə.

Gər xəyali-şəm edə pərvanə külbəmdə qonar,
Minnəti-seyri-çırağan bu sipehri-dun bənə.

Şişə elçi, ğülğüli-mütrib olmuş bərhəman,
Xümdən onu göndərübdür ruhi-Əflatun bənə.

Keçmə həqdən gər şikayəti-yaran qılsan, Vəhid,
Ox kibi yaydan keçər, daim yetişdi çün bənə.

* * *

Şəm'in, ey pərvanə, fikri-şam tar etməz bənə,
Bən əgər olsam çırağ, ol ki, bil, artmaz bənə.

Ondan ötrü ançe mən ağdan-qadan çəkmişəm,
İki başı ara leylü nəhar etməz bənə.

* * *

Könlümə göz nikuyin valeh olursan sənə,
Göstəribdir məgər an şuxi-rüxi-kar sənə.

Xar xarın ilişür canü dilə xar kimi,
Bilmənəm kim, nedim, ey güli-bixar sənə.

Ey dili-zar, kəmər bəstəlü qüvvətin şöhrət edər,
Şeyx bağlarsa əgər töhməti-zünnar sənə.

Hər gecəm zülfi kibi bin gecədür, ey naseh,
Rövşən olmaz bilmənəm hali-şəbbar sənə.

Ey dili-xəstə ki, tərki-məni-şeyda qıldın,
Nə deyübdür söylə ol qəmzeyi-pərgar sənə.

Üqdeyi-xatirimi əşk edir cümlə şümar,
Gər düşə bir gecə bu dideyi-xunbar sənə.

Ey dili-xəstə ki, xəşminə olubsan mail,
Söylə kim, neylədi bu  hindi-cigərxar sənə.

Camda əksi-rüxün daruyi-bihuşidir,
Söylə kim, neylədi bu nəş'eyi-sərşar sənə.

* * *

Bən kibi etdi səni hüsn-giriftar sənə,
Deyim əgyar sənə, ya ki deyim yar sənə.

Qandan olmuş güli-rəna kibi çöhrəm gülgun,
Heyf kim, olmadı məlum təhi-kar sənə.

Rövşən etdin gözümi şəm'i-şəbəfruz kibi,
Xoş gəlür, xoş bu gülguni-dəstyar sənə.

Səndən ötrü rəngim kibi viran edər bünyadımı,
Öylə çağlarsan ki, hərfi-səxt kar etməz sənə.

* * *

Qalmamış çün buyi-hüsni kimi heç bəndən san,
Bu səbəbdən yar bir qıl etibar etməz bənə.

Görmüşəm sağərimi hər ki sayar aşiqləri,
Deyə bilməm yar lütfi-bişümar etməz bənə.

Şiri-madər kibi olmuş bəski, adət etmişəm,
Zəhri-çeşmi-yari-bizinhar kar etməz bənə.

Şövqdən tutmaz dilim, gahi və gahi tutular,
Vəsl edən bidadı, hərgiz hicr yar etməz bənə.

Tər tökür baran kibi hərgəh, düçar olsam ona,
Yari-bipərva demə, gövhər nisar etməz bənə.

Xarmahi kibi do çeşmimdə hər suyi-səfid,
Çareyi-dəryayi-sirişk bikənar etməz bənə.

Yar əgər güldürsə, bülbül kibi əfğan eylərəm,
Leyk nişi-xari cövr- xəsm kar etməz bənə.

* * *

Etmə can, naseh, məgər canın gərəkməzmi sənə,
Get, bəni incitmə, imanın gərəkməzmi sənə.

Gəzmə şəm'i-naləmin başına çox pərvanə tək,
Ey fələk, guya ki, dövranın gərəkməzmi sənə.

Ey əsəl, etmə hədisi-ləli-ənqoşt pıç,
Özünə rəhm et, məgər şanın gərəkməzmi sənə.

Nalərni, gərdun, əritmə, durma, bülbül, get çəkil,
Çağlaram, ey bixəbər, canın gərəkməzmi sənə.

Ey sədəf, fəryadıma verdin qulağını məgər,
Yadigari–əbri-neysanın gərəkməzmi sənə.

Ey Vəhid, xəstə canını əritdin nalədən,
Bu nə əfğandır, məgər canın gərəkməzmi sənə.

* * *

Əzbəs əsirdür bu dili-mübtəla sənə,
Hər parəsi dua edəcəkdir cüda sənə.

Vəqti-vida bağrımı qeyrət edər kəbab,

Gər yari-mərdüm ola həmrəh cüda sənə.

Bu bikəbab dildən aparmış güman gəlür,
Məlum ola əgər yetə peyki-səba sənə.

Səni ruhi-pak cümlə tənü tən təmam xak,
Handan nigahım oldu böylə aşina sənə.

Olubsan imdi böylə, vəli bundan eylədi,
Rəngim əgər üçdusa, verdi səda sənə.

Bu qocaya məgər bilsən neyləyib qəmin,
Uğratsun abi-heyvan səni, ya Rəb, cüda sənə.

* * *

Özünə düşmənlik edər eyləyən ülfət sənə,
Heç rəhmin gəlmədi aşiqlərə, rəhmət sənə.

Zülfünün hər tarına bir pareyi-dil bağladım,
Az, əgər çox, ey cəfacu, bu imiş qismət sənə.

Qalmadı axır mövcə əbri-nisan, heyhat,
Basdı şuri-dil bəni, ta sinə rahət sənə.

Ey ki, daimdir çəkilmiş çarmixə fikrətin,
Aləmi dar eyləmiş əsbabi-cəm'iyyət sənə.

Xəlqi-aləm çün bəni saymaz dəxi adəmşünas,
Çün səni gördi, edər lənət bənə, lənət sənə.

Necə sındın, ey Vəhid, ol müəyyidən sən birisən
Kim, yari-rübaə təki canan edər diqqət sənə.

* * *

Yarı görmək bişüur müqərrərdür bənə,
Şükrlillah eyşi-cavidan müyəssərdür bənə.

Əksi-ruyi-yar çün çeşmi-tərimdən getmədi.
Baxıram hər yanə, timsali müsəvvərdür bənə.

Nəş'eyi-didar-saqi, iztirabım …
Gərdişi-aləm şəbi-vəslində sağərdür bənə.

Ömrümüzdən sayılır ruzi-səfidü şami-tar,
Lütfilə qəhri-ikisi həm bərabərdür bənə.

Bir də, qasid, nəql elə hər nə eşitdin yardən,
Kim mükərrər sözlərin qəndi-mükərrərdür bənə.

Bu səbədən kim ona düşmüş xəyali-ruyi-yar,
Çün dil abi-həyatü abi-kövsərdir bənə.

Fikr ayağilə degildür mümkün bundan çıxmağım,
Təngnayi-seyri-guya dəşti-məhşərdür bənə.

Çıxmaz odun şərarəsi əzbəs urma, məşğuldur,

Yarımın ayinəsi səddi-Skəndərdür bənə.

Dastanlar fərbə olmuş vəsfi-zə'fdən, Vəhid,
Ruzi-rəsmdən bədəl bu cism lağərdür bənə.

* * *

Arizin mey çəkməmiş mey kibi gülgundur bənə,
Sərv qəddin etməmiş təqti mövzundur bənə.

Saya bilməm gər ola əncüm bənə rigi-hesab,
Ey ki, cövrün gərdişi-gərdunun əfzundur bənə.

Dərd dərmandur bənə, cana, əgər sənsən təbib,
Zindəganımsan, sirabi-zindəgi çündur bənə.

Görmədim bir ev iyəsi tək ev dən bixəbər,
Bəndən əhval istəyürsən hali-dil xundur bənə.

Çeşmi-giryan mane olmuş könlümün bəd gününə,
Hər birisi halədən bir Dəcleyi-xundur bənə.

* * *

Yadi-ruyin sahibi-dildür, demə mehman ona,
Olmayım qurban sənə, gər olmayım qurban ona.

Qanlu yaşımdan degil mümkün edə qət'i-nəzər,
Çünki ol həm baddur, həm sərvi-gülrizan ona.

Giryə çün gəldi, onu mən' eyləmək mümkün degil,

Yaş uşaqdur, gəlməmişdür sədd barından ona.

Şəm əgər pərvanə yandırdı, bica etmədi,
Şiveyi-rüsvalığı vardur çü giriban ona.

Məstdür, pərvası yox, olur əgər aləm xərab,
Əşkrizan xoş gəlür çün rizişi-baran ona.

Hər kim olmuş öz gözinə mahi-Kən'an kibi məhrum,
Gözə nərgis görünür guşeyi-zindan ona.

Gər Vəhidi yar topraqdan götürdü əbr kimi,
Etdi ehsan, etmədisə nəf bu ehsan ona.

* * *

Dövri-əvvəl payi-qaşı bihədd navəki-müjgan bənə,
Yayi tək ismi keçdi ol məhi-taban bənə.

Etdi şərri dövr kibi kim, əsiri-şiri edər,
Can acısını soruşur eşqi-bipayan bənə.

Şimdi dilərəm ləzzətindən düşməyəydim bixəbər,
Yari-biəğyar imiş bu dərdi-bidərman bənə.

Boynuna ehsan bardur, hərçənd vəsli-yardur,
Eyləmiş ehsan bənə kim, etməmiş ehsan bənə.

Dərmənəm gül,gəlmişəm, qurbanınam, dərdin dərim,

Lütf üzündən söylə, cana, dəgməsin dərman bənə.

Mümkün olmaz kim, fəğanü nalə dərdindən həkim,
Eşq təşrifi göndərmiş zibəs ehsan bənə.

Halımı əzbəs ki, canan cövrdən dərhəm görər,
Canım alan çağda çağlar kim, veribdür can bənə.

Dərdi, yarəb, can çıxan çağda tənimdən çıxmasın,
Dadlu candan dadluraqdur bu qəmi-canan bənə.

* * *

Müntəzir aşiq əgər rindan olur səhra ona,
Könlü oynar, sövti-dəfdür sədayi-pa ona.

Oynaşır gül bayrağı, hərgəh əsər badi-səba,
Məktəb içrə şux uşaqlardır müəllimdən cüda.

Nəzr etmişdim ki, yarı görgəc imandan keçəm,
Etdi canan aqibət pir eyləyən bədrə vəfa.

* * *

Nəsimi-ahdən bir dil pərişan olmasun, ya Rəb,
Bənim könlüm kibi bir qönçə xəndan olmasun, ya Rəb.

Hübabi-bad kibi görüldün, götürə bilməm,
Bənim tək yarsız bir didə heyran olmasun, ya Rəb.

Tiri-qəza ona yetdükcə bənzər imtəhan etdim,
Bir insanə hərgiz miri-divan olmasun, ya Rəb.

Varar bir xəndə çün fəryad edər gül kibi bir biqəm,
Bu gülzar içrə hər bülbül qəzəlxan olmasun, ya Rəb.

Uçar könlüm quşu, yarə yetişməz sərim heç kim,
Anın tək aşinahımdan gürizan olmasun, ya Rəb.

Nə din qaldı, nə taqət, qə qərar, nə səbrü nə iman,
Düşən eşqə bənim tək bir müsəlman olmasun, ya Rəb.

Bu gərmi-şəb füruzun mehrinə viranə aldanma,
Çü gəlməz özinə rəhmi, firavan olmasun, ya Rəb.

Cəhan bəzmində bənzər şəm'i-bəzmə sahibi-əfsər
Yanar, əmma deyər bu dərdə payan olmasun, ya Rəb.

Əgər niku, əgər bədaşiqə-heç kimə rəhm etməz,
Deməz heç kimə əbrin çeşmi giryan olmasun, ya Rəb.

Səlami-rustahi kibi şəhri bitəmə olmaz,
Sənünki kəs rəfiqi-bağü bustan olmasun, ya Rəb.

* * *

Deyirdim kim, xədəngin tək cüda can olmasun, ya Rəb,
Yalandır kim, deyə bilməm ki, viran olmasun, ya Rəb.

Könül varmaz deyəm olsun bu viran olmuş mənzil,
Dilim varmaz deyəm bu evdə mehman olmasun, ya Rəb.

Tənimin gül kibi hər zərrəsi bir canibə getdi,
Bənim könlüm kibi heç dil pərişan olmasun, ya Rəb.

Fəğandan könlümi sığdırdı gül çün niqab əldən,
Gül açıldı, demə bülbül qəzəlxan olmasun, ya Rəb.

Cəhan bəzmində bənzər şəm'i-bəzmə sahibi-əfsər,
Yanar, əmma deyər bu dərdə payan olmasun, ya Rəb.

Vəhidi-xəstə gülşən seyrinə göz gəzdirə bilməz,
Nigun xəstəyə heç dil pərişan olmasun, ya Rəb.

* * *

Əgər niku, əgər bədaşiqə-heç kimə rəhm etməz,
Deməz heç kimə əbrin çeşmi-giryan olmasun, ya Rəb.

Bənə can acısını vəsli-canan eylədi şirin,
Əgər canan nəzərdə olmaya, can olmasun, ya Rəb.

Vəhidi-xəstə gəlmiş seyrinə, göz gəzdirə bilməz,
Nigun xəstəyə heç didə heyran olmasun, ya Rəb.

* * *

Ey seyyidnüma, olub od dili-zarım, cigərim ab

Həq şərindənü mah tək et tərmimi məhtab.

Qismətdən əgər bilməyə, kimdən nelür aya,
Dəryadə təhi gərdəni sağər girdab.

Kəs eybini böylə ki, duyar, özgəsi duymaz,
Gəlməz belə kim tiflə, əmma sinə giran cəvab.

Çün şeyda edəsən xəlq sənə səcdə qılurlar,
Gər püşt edəsən Kəbəyə, məscidə çü mehrab.

Hər kim ki, xərab eyləyə hərcayi bica,
Sinəsidür özünə çün mövcə seylab.

Doğdu günümi hamilə şişeyi-səhba,
Etdi qədəhi-badə genə məclisi-məhtab.

* * *

Nəş'eyi-eşqin bəni etmiş zi bəs məstü xərab,
Bu yandan girmənəm ol yanə manəndi-kəbab.

Safdil gəh şeyxü gəh sufi və gəh meyxarədür,
Gah güldür, gah xardur, gəh məzə, gəh badeyi-ab.

Ru edər daim bənə məktubumi ol bağrı daş,
Kuhdən həm sailə böylə gəlür daim cəvab.

Çün hənayi-dəsti-xuban çöhrəsin örtər, vəli
Dilrübalıqda degil kəmru xubindən niqab.

Bən ki, dəryakeşligim girdab tək məşhur idi,
Xaneyi-təsvir tək bir qətrədən oldum xərab.

Çahi-Kənandan çəkildi mahi-Kənan ab tək,
Şərmi-ruyindən çü açdı dilbərim bəndi-niqab.

Hüsn çün zati olur, məşşatədəndür biniyaz,
Eyninə mümkün degil möhtac eynül-səvab.

Cana məstdür, bana hər cövr ol bədxu edər,
İstəməm arayə gəlsün rəşkdən payi-hesab.

* * *

Etdi pərişan könlümi çün nübab,
Şişeyi-səyyar yari-bicayi-gülab.

Könlüm əgərçi açılır çün kitab,
Leyk duruqdur darısı çün kəbab.

Çöhrəsi ta oldu əyan şərmdən,
Güllər ərindivü çəkildi gülab.

Dil aparur rəngi-hənasi kibi,
Örtər əgərçi rüxi-xubin niqab.

Şəm kibi yarə səba gər əsər,
Sayə kibi bən edərəm iztirab.

Sərfi-sirişk oldu əgər ləxti-dil,
Böylə xəyal eylə ki, apardı ab.

Bülhəvəs əşkidə var ləxti-dil,
Abi-sərab ər edər isə hübab.

Mövcə əsəri kibidür bəstərim.
Xabi-fərağət çü edəm iztirab.

Hər nə edər, canıma minnət, Vəhid,
Gəlməsün aramıza payi-hesab.

* * *

Qət olur axır sənə gər eyş, əndər tərəb,
Çəkilən bir-iki başı aradur bu ruzü şəb.

Bədnümadur cayi-canan kibi halı cami-mey,
Busə tək peymaneyi-mey həm gərəkdür ləbbələb.

Tərki-vəsli-yar aşiq məzhəbində küfrdür,
Buni etməm, səhldür, etsəm əgər tərki-ədəb.

Ruzədar vəslə xəti müjdeyi-iftardır,
Xoş gəlür mahi-rüxundə çün oruc ayında şəb.

Sağəri-ləbrizdən şəninə xoşraq gəlür,
Yari-bədxuyi görən hərgah ləbrizi-qəzəb.

Ol ərəb gər əlimə girsədür daği-hizüm,
Necə kim göftardə xeyri-əcəm, dəhəni-ərəb.

Ta ki, çıxmış şərmindən ol mahi-taban ay kibi,
Ağzı açıq mahi-novin kibi qalmışdır əcəb.

Şaxi-gül tək sağəri əldən buraxma, ey Vəhid,
Şükr, möhnət getdi, gəldi mövsimi-eyşü tərəb.

* * *

Rəhm qıl axır məni-biçareyə, ey pürfərib,
Çünki düşmüşdür sənin hüsnün dəxi mən tək qərib.

Rişteyi-canım dolub, canan bilür əhvalimi,
Necə kim, əhvali anar nəbzdi mərdi-təbib.

Surətini tişə zərbilə çıxarmış kuhkən,
Xun üzinə özüni sə'yinə qılmışdır rəqib.

İləri andan ki, canan apara imanımı,
Həm çün qayrub müjgani əbrudi səlib.

Hüsn ol bimehrdən qeyri ki, hər göz görməmiş,
Verməmişdir yüz bənim halım kibi müşkil qərib.

Zülfinin hər tarına gər bağlaram bir ləxti-dil,
Sənə qismət, bu bənə həm olmamışdır bir nəsib.

Şəm'ü gül  mətlubü güldür, ta görübdürlər səni,
Kəc olub pərvanə mən kibi sayıqlar əndəlib.

Mərdümmi-çeşmim kibi bir tifl kim qəddün görə,
Dərsi əşkimdən rəvandır bimüəllim, biədəb.

Zə'f əzbəs yardan pünhan bəni etmiş, Vəhid,
Nəbz tək hərgiz bəni gördükdə görməz bu təbib.

* * *

Şəm çağları canan çeşmi-giryanım görüb,
Nəqş ayrı sağınır hali-pərişanım görüb.

Eşq etmişdi bəni çün lalə ol camsuz,
Görmədi bir yanımı məşuq biryanım görüb.

Görmişüz edər sirayət bu mərəz, yəni ki eşq,
Bənə heyran oldu canan çeşmi-heyranım görüb.

Bəni biiman sayırdı zahidi-mərdümfirib,
Oldu lal ol namüsəlman dinü imanım görüb.

Böylə kim, məhşərdə bulmaz aşinası aşina,
Tapmadı pərvanə şəm'in şami-hicranım görüb.

Aftabi-şəb sayardı şəm'i-məclis özünü,
Əşki-xiclətdə boğuldu mahi-tabanım görüb.

Bir cəhani-can ta müşəxxəs oldu yarım qisməti,
Yusifi saqi Züleyxa cinsi-ərzanım görüb.

Kar guya dövdir xəlqə bəni kəmdövr edən,
Qeyr tapdı gəncimi bu xani-viranım görüb.

* * *

Munca etdin bəs degilmi şiveyi-cövrü itab,
Ey gözün zülmündən olmuş xaneyi-səbrim xərab.

Bu nə təmkindür ki, səndən söz qayitmaz aşiqə,
Kuh bağrı taşdır, əmma edür rəddi-cəvab.

Ağzının bir dərdə əhli-dərd əhvalın bilür.
Atəş içrə aşiq əhvalinə qan ağlar kəbab.

Sinəsi tək ki, divar arası pünhan qalır,
Yetməmiş xəttindən oldu xaneyi-səbrim xərab.

Qalmadı heç kim ki, lütfündən muradın tapmadı,
Qapına gəldi Vəhidi-bivəfa, verdin cəvab.

* * *

Novbahar oldu, genə açdı yüzündən gül niqab,
Xaki-gülşən mətləindən doğdu nurin aftab.

Doldu güldən batin kuhsar bir qırğan kibi,
Ni qoyub qövsü qüzeh, şimdi çəkər andan gülab.

Çənbəri-dəf kibi oldu cilvəgər qövsü qüzeh,
Oynadı xeyli pəri tək göydə hər yandan şəhab.

Gər xəmi-mey olmamış görər məni, ya Rəb, nədən,
Cəzb edən suyi edər gül sağəri içrə sərab.

Gülşən içrə bəs ki, qurdi sürud qumri söhbəti,
Oldu gül üryanü köynəkcik, çək gürz, həm hübab.

Ruzi şəb gəzmək sərasər bəs ki, olmuşdur zərur,
Səbzə tək səyyar edər daim ayaq üstündə xab.

Böylə yaz fəslində əzbəs eybdir hüşyarlıq,
Məst oldu bülbülü gül, nəş'ədən oldu xərab.

Xoş gəlür damani əzbəs daməni-madər kibi,
Kuhdən Fərhad fəryad etsə, qayıtmış cəvab.

Odlanur səyyar canı bir nəfəs gər gəzməyə,
Neyləsün, biçarə gül oduna olmuşdur kəbab.

Bağban piri-Muğan tək nola gər etsə dimağ,
Söylədi əks şəqaiq, etdi həmrəngi-şərab.

Dəftəri-gül şərhini bülbül edə bilməz bəyan,
Çöhreyi-şahid kibi bir səfhəsidür bir kəbab.

Qönçə tək könlüm edər tiği-təğafül çak-çak,

Verməz isə bülbülə ahəstə buyi-gül cəvab.

* * *

Ey məta, eşqinə olmuş tələbkar aftab,
Vəslinə əzbəs ki, olmuşdur tələbkar aftab.

Bu nə yüzdür, bu nə göz, bu nə abü bu nə tab,
Mey kibi meygun ləbin etdi bəni axır xərab.

Qarə edərsən cəhan kuyini, göstərmə üzün,
Şərmdən çıxmaz, çökərdi çün aftab.

Şükr müjganın edər ta baxmağın gördü könül,
Sixə yapışdı, çü odlamısan közdə kəbab.

Çü açdı ruyi-xoşundan səba xəmidə niqab,
Ərindi şərm rüxündən gülü çəkildi gülab.

* * *

Deməm ki, lütf elə, ey bivəfa, mənə dad et,
Rəqib cövr edəcək olsa. Sən həm imdad et.

Bu yolda rigi-biyabanı heçə sayma,
Əgər daşə, dağə yetsən, sorağü fəryad et.

Nişan çü nəqşi-nigini yoxdur arada bəndən,
Görsən ərirsən, bu məni-biçarəni yad et.

Gedüb özümdən ona yetmədüm, mürüvvət qıl,
Xəyali-yarimi vəsli-yarə irşad et.

Gözümə ta səni gördüm, yuxu gözümdə həram,
Çü güzgüyə baxasan, ey pəri, məni yad et.

Beqeyr əhli-dilə etmə halımı izhar,
Çü dağlı yerə etsən güzar, fəryad et.

Budur əgər sənə mətləb ki, mətləbə yetəsən,
Özünə şiveyi-şagirdi pirü ustad et.

Sərayi-axirətə xiştü gil zərur degil,
Hübab kibi onu əşk birlə abad et.

Görüb rəqibi-Vəhidi götürmə sən badə.
Söylə sənə dedi kim, tərki-adəmizad et.

* * *

Ey xatəmi-risalət və ey fəxri-kainat,
Səndən umar Vəhid nicatına bir bərat.

Mətləb sənün vücubun idi, qaziyi-qüzzat,
Aya elə edərdi çün təzvici-ümməhat.

Qəflətdə keçdi ömr, nədamətdən ağlagil,
Bu şəb yüzünə bu yuxudan özüni oyat.

Bir gün əgər yetərsə könül sübhi-vəslinə,
Şami-fəraq vəsfini qıl, sözini uzat.

Üşşaqdən zibəs ki, əsər zə'f qoymamış,
Olar bayramlara olacaq müntəhi cəhat.

Ta xaki-Kərbəla bənə olmuş qübari-dil,
Olmuş iki gözüm biri Dəclə, bir Fərat.

Ayineyi-cəmalına təhsili –vəsl üçün,
Race olur edərsə əgər gözlərim bərat.

Lütfün əgər bənimlə ola kar, səhldür.
Yaxın görər irağı olan eybini iltifat.

Yüzinə karə ver, həzər qıl rəqibdən,
Çün iltifat etmə bu heyvanə, ey  nəbat.

Bənə nə sər buraqmış qəmi-eşqin, nə səbat,
Bu mərəzdən bənə şayəd ki, verə Tanrı bir nicat.

Bir-biridən dəlməsən şişəsi dərdəm dağılır,
Nameyi-bəzmi yerinə gər məsəldirsə qəbat.

Qıldı kafər bəni nigari-müsəlmani-hüsnün
Ki, üzünü görcək, göndərir oldu sələvat.

Ləbi-canpərvəri-cananilə etmiş də'vi,
Bu səbəbdəndir əgər görməyə gün, abi-həyat.

Yetürür bişək, alur vəhşi-mürği-dilimi,
Qaşın alıcı quşu çün vurur iki qanat.

Eşq olan yerdə nədür taqət, varam onunla,
Sənə aşiq nə deyər, sən nə deyərsən, heyhat.

Çün hədisi-ləbi-canpərvəri-canan nazilə,
Hərfi-bixast çıxmaz, gər ağzın yumsa dəvat.

Şeş cəhətdən sənə gər baxılur olsa bular,
Olmaya qət edə səni rişteyi-ümmidi-nicat.

Açılur mə'ni üzinə qapılar çıxmaq üçün,
Biri-birinə çü bağlandı hürufi-kəlimat.

* * *

Gər sənə qan içirərsə, bari sən peymanə tut,
Xabi-rahət qıl, rəqibin sözlərin əfsanə tut.

Gər yanar ol qulun sərpəncə ilə şəm tək,
Ol təbi-atəşi-hüsndür, sən hər danə tut.

Ömrünü gər istər isən kim xoşu asan keçə.
Özünü bu təngnayi-dəhrdən bir yanə tut.

Çün bəni cami-eyş edibdür heyrəti-ləli-ləbin,
Saymasan gər, sevdigim, bülbülüni rəvanə tut.

Bal ravisinin evi tək dəhr olur axır xərab,
Bal üçün, ey dil, sənə kim dedi evdə xanə tut.

Sən əgər səyyadsən, nəxcir bihəddür bənə,
Gülü bülbül çağla, şəm'i-məclisi pərvanə tut.

Yar saqi, eyş baqi, məst bülbül, gül xərab,
Xürdə çox tutma bizə, zahid, bu gün peymanə tut.

Qafil öz hüsnündən olma, heyfdir, fürsət gedər,
Nə baxarsan könlümə, bir oda düşmüş xanə tut.

Gər dodağın bir gəz əmdim məstkən, tök qanımı,
Səhldür, sülh eylə, etdümsə əgər qan, qanə tut.

Gər dedim bimar cadu gözlərinə məstkən,
Bu həqirin canına bu cürmi, ey cananə, tut.

* * *

Xərababadi-dünyanı təmam abad tutdun, tut,
Ülumi sərbəsər təhsil edüb, axır unutdun, tut.

Yetişdin yarə, şiri-ləngərin şikvəsiz qıldın,
Bu şiri hərfini təqrir edən saətdə tutdun, tut.

Çü məlum eylədin kim, bunlara bir rah degül bağlı,
Açub göz, halımı tufan, əşkindən qurutdun, tut.

Güli-məqsud açılmasından çün bir səmər yetməz,
Çəküb gərduni yerə günbəgün anı sürütdün, tut.

Çəkübsən başını qanadına, ey qənimət bil,
Çəküb dəryaləri başına sağər tək qurutdun, tut.

* * *

Eşq dərsini oxurkən dinü imanı unut,
Han unutma pəndimi, bunu unut, onu unut.

Aşinayə çün yetişdin, tərk qıl biganəni,
Dərdi-canan müyəssər oldu, dərmanı unut.

Xaki-qürbət çün sənə şəkkərdür, ey dil, bəstə tək,
Yad etmə sinədən, bu künci-zindanı unut.

Möhnəti-dünyanı çəkdin, qərəzdir mərifət,
Çün bu viranədən gözün, gənci-viranı unut.

* * *

Dili-şikəstə əgər qaldı kuydə, sən get,
Sınıq ayaq ilə meykəş kibi özündən get.

Necə kim, ab alur şəbnəmü gögə çəkilür,
Təriqi-vəsldə, zinhar, etmə şivən, get.

* * *

Təbəssüm qıl, görünməz ağzını, cana, pədidar et,
Budur möcüz, sənə göstər, bənə yüzün var et.

Qübarım dağıdub min qatla, ey badi-səba, gərdun,
Rəayət etməyəndən hər nə gördün, yarə izhar et.

Nihanım çün sənə, ey səhli-əşkim, aşkaradır,
Mənim dərdi-dilimdən bixəbər yarı xəbərdar et.

Gəl, ey kuhsar, əgər bən kibi vardur naleyi-zarın,
Bu ağır yuxudan Fərhad timsalını bidar et.

Demə raic degildür, etməgil kəsbi-hünər bərgin,
Çü vardur Yusifin, kimsə deməz fikri-xəridar et.

Nə izhar eyləyim bəxti-bədidən bixəbər yarə,
Deməz xurşidi-aləmtabə kimi fikri-şəbi-tar et.

Deməm üzri-sitəm istə, muradım bu degil səndən,
Eşit etdiklərini, bircə-bircə məndən inkar et.

Sərapa atəşi-suzanda ölcək sineyi-dil rəhmət,
Yetərsən, ey fəğan, gər yari könlünə gülzar et.

* * *

Bən kibi çün ruyi-xubin görsə, ey kamil sifat,

Edə bilməz zəbt hirqəti dəhanında dəvat.

Tairi-əndişə çıxmaz dami-heyrətdən birün,
Mürği-dil kibi təmam ömr əgər versə qəsat.

Yar eşqində məlum oldu pabərcalığım,
İztirabım nəqş əbri kibi tapdı ta nəbat.

Ta şəbi-hicrə giriftar olmuşam ayinə tək,
Nə bilməm tənha özüm, gəlməz gözümə kainat.

Bəndən, ey naseh, uzatma sözüni, bir soruş,
Söylə qulmudur bəni aldadan, deməzəm yarə sat.

Şükrlillah, yarımın cövrü bənə məxsusdur,
Ta ki, bən varam nəzərdə, qeyrə etməz iltifat.

* * *

Ey Vəhidi-xəstə kim, kuyində varsan dövrgərd,
Yetməsən gər bir yerə cansən dəxi bir çarə et.

* * *

Var xəlq arasında yola get, iraqə get.
Durmaz qıraq bir qəza, bir qiraqə get.

* * *

Kimə məqdurdur ol çeşmi-süxəndan ilə bəhs,

Necə nadan edə əllameyi-dövran ilə bəhs.

Türfeyi-kəcbəhsdür əlbəttə bən bilirəm əndər,
Gər səri-zülfi edə ahi-pərişan ilə bəhs.

Zülfidin qeyri ki, hər tarıdür rütbə, vəli
Mizban görməmişəm kim edə mehman ilə bəhs.

Heç zad üstidə, yəni dəhəni sirri üçün,
Cani-dilzarım ilə dil həm edər can ilə bəhs.

Xəsmin halın, əlbəttə, tutarlar ixvan,
Gərək edərsə əgər Yusifi-Kənan ilə bəhs.

Ləldən rəng qaçar, çün ləlinə təşbih olar,
Gər hənayi-kəfi-canım edə payilə bəhs.

Mərdüm deyə canan edər əngüştnüma,
Anı gər etsə pəri hüsnündə insan ilə bəhs.

Mərdümi-çeşmim əgər şikvə edər yarımdan,
Böylədir kim eyləsə mur Süleyman ilə bəhs.

Cana minnət çəkərəm, hər nə edər yar, Vəhid,
Rəsm olmaz ki, gəda eyləyə sultan ilə bəhs.

* * *

Nə olmuş, söylə sevdigim genə hadis,
Bu cövrə nədür, bilmənəm, naz bais.

Olub Yusifə hüsnün ey ki, bərabər,
Səni ona sani deyəm, ya ki, salis.

Qədimidir əflakə bu rəsmü adət,
İnanma, ola fitneyi-dəhr bais.

Çü bais olur zahidin sözlərinə,
Anınçün olubdur mey ümmül-xəbais.

Həmişə yəmanə bitməyəcək bigüman,
Şərabın xumarı olur keyfə varis.

Ey dili-xəbis, meyxanəni bilməyübdür
Ki, müdərrisdədür andən artıq mübahis.

* * *

Gözüm açılır qönçeyi-xəndanını görgəc,
Dilim tutulur çeşmi-süxəndanını görgəc.

Görgəc xəmi-əbruyin olur kari-dilim rahət,
Qəddim bükülür sərvi-xuramanını görgəc.

Ləxti-cigərim cəm olur çeşmi-tərimdə,
Hər tari-səri-zülfi-pərişanını görgəc.

Könlümdəki əsrari-nihanimi edər faş,
Baxdıqca gözüm qəmzeyi-pünhanını görgəc.

Rəngim kibi, sana, süxənvər səbri-siyahidi,
Xunriz səfi-ləşkəri-müjganını görgəc.

Oldu ərəqi-xicləti-dəhr, mayə saçıldı,
Gövhər ağzında dürri-dəndanını görgəc.

Bülbül açılur gül kibi sən payə hər gəzəndə,
Gül qönçə olur qönçeyi-biganını görgəc.

Bildim silir qaşlarun gün səndən,
Baxıb gözün ol xətti-reyhanını görgəc.

Eybi ərinür ləli-ləbin möcüz edəndə,
Yusif çəkilür çahi-zənəxdanını görgəc.

Gülzardə oda yetişən tük kibi sünbül,
Çulqandı üzündə xəti-reyhanını görgəc.

Hərçənd ki, canı yoxdu, surəti-Şirin,
Can verdi sənin canın üçün canını görgəc.

Candan səni gördükdə təmə xəlq kəsərlər,
Gözlər tökülür suzəni-müjganını görgəc.

* * *

Müləmmə xirqeyi-zöhdü riyani kimə bəndən keç,
Səni bu rənci-yarın eylədi bidərd, sözdən keç.

Gülüstani-cəmali-dilkəşi hərgah açıldı,
Səni su eylədi şəm'i-rüxi, yəni ki, bəndən keç.

Hübabi-badeyi-xüm hərçənd  qalmaz qailə sərgərdan,
Göz açmaq bu qəfəs qapusidə, göz aç özündən keç.

Xudaculuq yolunda  dəxi bürhanı dəlil etmə,
Alur hərgah oyandı bu xabində zəhrdən keç.

Şərərin iki nasazın arasında məqam etmə,
Əgər divari-zindanın olubdur səngü ahən, keç.

Ümum bizə kim batsan …  xasdır hər yek,
Cərəş kibi əbəs, ey qönçeyi-gül, etmə sənün, keç.

Gəlür şani-əsəl tək didəmə bu daneyi-şirin,
Olarun kirdarındandır şəm'i-rövşən, keç.

Nişanım bu ki bəndən qoymamışdır qəm nişan baqi,
Gəl, ey məşuqi-bipərva dəxi rəhm eylə, bəndən keç.

* * *

Bir nigarın ləbinə çeşmim olubdur möhtac
Ki, həna kibi ona rəng veribdir ləl xərac.

Andan ötrü böylə mümtaz olubdur ki, bu tar,
Şişədən badə qızılbaş kibi başinə tac.

Hər ki, boynunu çəküb özünü mümtaz bilür,
Ona-buna gözünü xəlqi-cəhan çün amac.

Bilməzdi bu kəfi-xüşkdən axır nə müyəssər,
Oldu canimə əbəs elçi yazıq həllac.

Gəzdi Məcnun deməgil daməni-səhradə əbəs,
Ol qədər gəzdi ki, axır işinə tapdı rəvac.

Qalmasın böylə yetişdün çü o qəddin büküldü,
Əzəb su yetdi çü dəryayə alur məlhi-əcac.

Münhəsirdür ləbi-ləlində davəyi-mərəzim,
Sən əgər verməyəsən bu nigarana əlac.

Hər yerə baxsa özi-özinə nigahı qayıdur,
Abü ayinə olmaz üzli möhtac.

* * *

Can tapar aşiq təmənnayi-ləbi-yar etgəc,
Leyk napeyda olur canını izhar etgəc.

Düşər işdən kim ki, bir biçarəni əldən salar,
Çeşmi-səhhət görmədi çeşmi-bimar etgəc.

Bəs ki, kasiddir mətai-hüsni-Yusif sahibi,
Yusifi azad edər fikri xəridar etgəc.

Çeşmi-bimar oldu çün bimar etdi könlümü,
Özünə etdi əsər zəhri bənə kar etgəc.

Hal andə ta bəni xar gətürdi, qalmadı,
Bixəbər oldu bəni yarım xəbərdar etgəc.

Vədə vermiş, leyk məhruməm vüsali-yardən,
Çün çıxar gögə ahü zarım yarı bidar etgəc.

Gözün açub özünü gülzardən gördü cüda,
Nərgisi-xabi-ədiddən çərxi-bidar etgəc.

Sənsiz, ey bimehrü bipərva, vəgərnə bağdə,
Gül gülər özünə bülbül naleyi-zar etgəc.

Ruzigarə yarını azar vermişdür xitab,
Dil özünü cövri-cananə giriftar etgəc.

* * *

Ey əsiri-fəraq, candin keç,
Səy qıl, suddən, ziyandin keç.

Ta ki canan qübarimə yetsin,
Düş özündən iləri, candin keç.

Sənədür səngi-rah, səngi-nişan,
Buraxıb nasutunu, nişandin keç.

Kutəh olmaz fitadəlik qanadı,
Ol qubar, rəhi-asimandin keç.

İstəsən ki, şəm'i-bəzm örəsən,
Razı ol kəsri-nəfsə, şandin keç.

Gülə gər dari-eşqin, ey bülbül,
Buyi-gül kibi aşiyandin keç.

Etmə ustadəlik, gedər fürsət,
Gəl-gəl, ey şux imtəhandin keç.

* * *

Necə kim almış hənadan ol nigarım əl xərac,
Rəng alurlar ləbləri yaqutdən buyinə bac.

Etdi çeşmi-xunfəşanimdən bahar ərğəvan,
Sayının fərsəng dildarım yolunda hər qac.

Vəsl edüb çeşmü dilü rəngim tamaşa qılmadı,
Bunda salarsan kəsakəs, anda-anda qaçaqaç.

Yaxşıdır yüzi, yamandır sözi ol sərvi-ləbin,
Rəhmi yoxdur, nazı çoxdur, özü toxdur, gözü ac.

Rənc çağlar səhhəti hər kimi qəm etdi məriz,
Yari-biəğyardur üşşaqə dərdi-biəlac.

Adəm etdi zahidi peymanəkeşlər səhhəti,
Ab həm mey sayılur, mey birlə çün tapdı məzac.

Durma, sən bir ləhzə söz üstündə bu naxoş əda,
Bədnümadır gözlərim, səndən çəkür dəst ixtilac.

Qönçə tək ta çulğaşıbdır yar zülfünə Vəhid,
Öz-özünə açılur, əzbəs ki, edər ibtihac.

* * *

Cani-şirindən edər pərvanəni bizar sübh,
Bu xəyal edər ki, olmuşdur ona qəmxar sübh.

Oldu kutəh şami-hicranım ki, ta görsün səni,
Olmadı şəb nimə, oldu şövqdən bidar sübh.

Cayi-heyrətdür ki, tiğ əlində xəndan olmağın,
Bir nəfəs ömr ilə etməz tərki-bu biar sübh.

Görmüşəm şərmi-cəmalından çü çıxmaz aftab,
Varsa hər yerdə canan, andə daim var sübh.

Qan edər məzlumlar əfğanı daşın bağrını,
Çəkməmişdir bir nəfəs qeyrində biazar sübh.

Necə kim, bikar edər şəm'ü çırağı nuri-mehr,
Gün əbəsdir xaneyi-yarımdavü bikar sübh.

Kafər etmiş həm şəbi, həm sübhi zülfi-arizin,
Görünür andan miyani-şəbdə çün zünnar sübh.

Şami-hicranımı çeşmi-xəlqdən etdi nihan,
Görməmiş dun ömrümüzdə kim olur səttar sübh.

Bəs ki, yüngüldür yuxusu bu utanmaz kafirin,
Ta görübdür canımız, filhal olur bidar sübh.

Şəb bənə çün vəsli-canan yüz verür pərvanə tək,
Ruzi-şam tardur çeşmimdə şami-tar sübh.

* * *

Surahi gərdəni oldu kəlidi-babi-fütuh,
Açıldı nəş'əsidən üqdeyi-səbuh.

Xilas etdi bəni mövc xeyri-möhnətdən,
Şərabi-köhnə olub Nuhü Ham, kəştiyi-Nuh.

Həzar qıfl əgər olsa meyküsar üzinə,
Hübabi-badə kibi bikəlid olur məftuh.

Şərabi-mövcdən, ey dil, əgər inan edəsən,
Dəlil olur sənə mətləb, əgərçi ola həmuh.

Üzüm heybanı dişlədivü hasil oldu şərab,
Ləqəd əfut əya rəbbül-əzimül-məşruh.

Şərabi-busini cam ilə gər içsəm mustəmir,
Olub xumar sənə tövbə ki, etdi bəsuh.

* * *

Dərdü fəryadımın heç birinə çarə yox,
Həsrəti-didar çox, taqəti-nəzzarə yox.

Ey ki, alubsan nişan bu dili-sədparədən,
Didədə bir parə var, sinədə bir parə yox.

Aldı dilimdən nişan zəxmi-dilimdən xəbər,
Necə yoxa var deyim, necə deyim varə yox.

Çeşmimə çün təng idi yar çeşm, yaşırdım başım,
Yarələrimdən xəbər aldı, dedim tarə yox.

Çəng kibi naləsiz bir damarım qalmadı,
Hara sızıldar deyim dilbərimə, harə yox.

Səng eləyən bir rəh kim gedəsən sürünür,
Əqrəbi-zülfün kibi bir dəxi hərarə yox.

* * *

Nigəhim dilbərimin yüzinə uğrar küstax,
Necə kim, şəm'inə pərvanə verür yer küstax.

Yoxdur ağizü dilim, bəndən eşit doğru xəbər,
Demişəm bu sözü məşuqə mükərrər küstax.

Biməhaba sənə gər halimi versəm, nə əcəb,
Qövl olur çünki qədimi, olur əkbər küstax.

Biməhaba oluram, çünki gözüm gördü səni,
Necə kim məst edir nəş'eyi-sağər küstax.

Şö'lə çün çəkdi dəhənin, şə'm dilin kutəh edər,
Salur işdən bəni dil başı eylər küstax.

Bir ilandur bənə hər tari cüda vəsl günü,
Çün qucar boynunu ol zülfi-müənbər küstax.

Seyd səyyad ilə oynar, çü ona ram oldu,
Lütfün etdi bəni xun, oldu mükərrər küstax.

Dilini su elədi, dərdü xəyalı oynar,
Ruzü şəb bu sud çün tifli-şinavər küstax.

Çəkərəm nazını, hərçənd uduzdum oyunu,
Necə kim dad çəkər mərdi-təvangər küstax.

Ey nəsimi-səhəri, kuyinə gərdimi apar,
Ta sənünlə gəzəlim andə sərasər küstax.

* * *

İstərsən biləsən andən nə çəkdüm, bənə bax,

Yandırır daim bəni bu mayə gərdişi-anə bax.

İstəyir nəqdi-həyat ilə alim bir Yusifi,
Mayəmi gör, sudimi fikr et nədür, sevdayə bax.

Yarım ilə laf urub istər olması rubəru,
Bu nədür tutdum ki, ey dövr, tutulmuş ayə bax.

Gər kiçikdir, gər böyük öz nəf'i düşmüşdür qərəz,
Sudsiz anar varmı o şad dili danə bax.

Aqilin eyşini Məcnun eyşilən etdin qıyas,
Təngnayi-şəhrdən çıx vüsəti-səhrayə bax.

Nam hərgiz tapmadı dünyadə bir sahib vücud,
Heçdən olmuş şöhrət ilən aləmi-ənqayə bax.

Qətreyi-biab gövhər o çıxarmış bəhrdə,
Seyrdən etmək istər xatirin dəryayə bax.

Köksündən göz götürməz çün edər seyri-çəmən,
Bir çöpə almaz güli-xəndanı, istiğnayə bax.

* * *

Hasilin canan səri-kuyində xəridar yox,
Ey səri-sərgəştə, guya səndə bir qıl ar yox.

Zə'fdən qeyri bir özgə pasiban yoxdur bənə,

Rüxsəti-izhar vardur, qüvvəti-göftar yox.

Çeşmi-canan kibi yox köksüm evi bimarsız,
Gərçi bu evdə nəvayi-naleyi-bimar yox.

Nə gəlür muyi-miyan, nə zülfi-canandır mənə,
Aşiqəm, aşiq, bənə fikri-kəmü besyar yox.

Qönçə tək dərdi-dilə çülqanmışam, şimdi bənə,
Fikri-ruzi-rövşənü pərvayi-şami-tar yox.

Dərdi eşq əhlinə var azar çox, əğyar çox,
Onlara əmma cəhanda yar yox, qəmxar yox.

Aləmi əzbəs ki, etmiş nəş'eyi-hüsnün xərab,
Dinü məzhəbdən nişan az, badeyi-zərərbar yox.

Etdi rüsva ol dəhanı, razımı etdi əyan,
Ləli-canı sevmək kibi bir xuniyi-əsrar yox.

Surəti-əhvalı çəkmək daşə bir müddət çəkər,
Kuhkən aşiqə pərvayi karü bar yox.

* * *

İstəyibsən kim səni öldürdü, ol rüxsarə bax,
Birəhm, bimürüvvət, bihəqiqət yarə bax.

Görmüşəm həm cami-Cəmdür, həm Skəndər güzgüsü,

Göz gəzər dünya fənasın, sayeyi-divarə bax.

Bu qoca vəssi deyərlər, qismət olar aşiqə,
Könlümü yandırdı qəmdən, dideyi-bidarə bax.

Bülbülü saymaz bir əhmər qönçəvü gül damənin,
Özünə rəhm eyləməz, bu qanı duymuş xarə bax.

Etməmiş qanlu nəfəsdən qeyri bir ehsan bənə,
Heç məni əldən buraxmaz, cani-dəvidarə bax.

Gördü dün ol büt Vəhid-xəstəni, xəndan dedi,
Küfrə bax, imanə bax, təsbihə bax, zünnarə bax.

* * *

Çarəsizdir eşq dərdi, olur əfğanın bülənd,
Qoyar isəm filməsəl gər mey kibi fəryadə bənd.

Dadrəsi gər gülab içəndə məlum olur
Kim, degildür gülrəng kəlimatı qeyr əz zərxənd.

Gör nə kəmzərfəm ki, sığmaz gər bəni qəm nadirə,
Bu dili-bütkədəmdə bir əfğandan yox çün sipənd.

Etmə, ey zalim, sitəm məzlumə, ahindən saqın,
Gusfənd tək yunundan götürər dərdməndə kəmənd.

Könlümün hər ləxtidən bir nalə dərdindən çıxar,

Eylə çağlarsan, silinmişdir orda məsti-sipənd.

Öz gözündən gər sənə cövr etsə gər canan, Vəhid,
Xublardan çün özün bu zalimi etdün pəsənd.

* * *

Rövşən etmiş mərdümi-çeşmim cəmalindən səvad,
Kimsə bilməz bu dəvat içrə xətindir, ya mədad.

Kəbəteyn tək gər rəfiq olsa bənimlə dilbərim,
Bənədür yalquzluğum həmrah çün hali-ziyad.

Səndən ayırldım əgərçi töv'əmi-madam tək,
Leyk ağuşumda yatmışdır nişani-ittihad.

Çün bəni tərk eyləmək, cana, sənə mümkün degil,
Bilmənəm axır nədür bu bivəfalıqdan murad.

Nameyi-bihəddini meyi-canan əgər görsə tapar,
Kim ona məzmun qübari-qissədür, çün girdbad.

Şəm bəndən yarıma bir nameyi-piçidədir,
Oxur əlimi andan var əgər sahib səvad.

Böylə nəqdi-səbrimi bən sənə verdim satmamış,
Vər nə öz gözünə etməz kimsə sana etimad.

* * *

Gər qoyarsa dilimə ney kibi şərmi-eşq bənd,
Sinəmin dağından əfğanım olur dərdim bülənd.

Verməz əhli-məclisə ney bir nəfəs söz fürsəti,
Gör ki, neylər bir kəsilmiş dilin bu dərdmənd.

Kim ki, daim özgəsin qeyd eyləmək fikrində var,
Özü olmaz qeyddən azad çün tabi-kəmənd.

Zəhr düşnaminə qatmış hidə səbəbdən abi-Xızr,
Bu səbəbdəndür ki düşnami degil hərgiz kəşənd.

Bir özüm tək Kəbə küyində canan görmədim,
Xarü bimarü qəribü bikəsü zar, nəjənd.

Səhldür gər küfr olmuş zindəlik pərvanəyə,
Ona aşina şəm olmuşdur kitabi-eşqi-zənd.

* * *

Ey mükərrər sözlərin qəndi-mükərrər tək ləziz,
Zəhri-çeşmindir bənim kamimdə sağər tək ləziz.

Guşimə ta yadi-ruyin könlümü etmiş vətən,
Zari-əfğanım gəlür peyğami-dilbər tək ləziz.

Ta axıtmış yuxumu, ey bivəfa, cövrün gəlür,
Didəmə sübhi-qiyamət şiri-madər tək ləziz.

Şəhsuvari-eşqini bu gərddə ta bulmuşam,
Bənə olmuş gərdi-külüft abi-kövsər tək ləziz.

Ey ki, etmiş nəş'eyi-hüsnün cəhanı bişüur,
Dövri-hüsnündür bənə dövran sağər tək ləziz.

Bu saçılmış abdən pərkalə dili-çeşmimə,
Bağdə olmuş gülün ovraqı ibar tək ləziz.

Bu dili-surax-suraximdən əfğani-həzin,
Yari-bipərvayə gəlmiş dudi-məcmər tək ləziz.

* * *

Ay dügünsüz ola bilməz didədə bina nur,
Hər kim ola ona bir sən kibi dilbərdür zərur.

Özünə güc etmə, məğrur olma, yarü rəvənd
Gör nə məhbus edübdür Rüstəmi Bəhrami-Gur.

İkisi həm bitəfavüt görsədür həq qüdrətin,
Şöleyi-mehri-cəhantabü çırağı-çeşmi-mur.

Çün degilsən artıq özündə var bənə …
Cuşimə basdın və işimə boşalır, ey sahibi-qürur.

Bu sarayi-ariyətdə tirə olmaz xatirin,
Gər sönməz könlümün fanusində şəm'i-şüur.

Xəndəsi abi-həyatü ləbləri hübbi-nəbat,
Dili şirin, sözü acı, tövri meyxoş, şuri şur.

Görmə kim göz birlə, cana, bu dili-suzanımı,
Abi-tufan sirişki dağıdıbdır bu şur.

Ey ki, sən kibi bir özgə xublərdən düşməmiş,
Sənin ilən bilmənəm üftadəlik olmuş zərur.

* * *

Sənə agah olmaq iztirabımdan nə mümkündür,
Ki, yarın batinində abi-gövhər kibi sakindür.

Təəccüb qılma, gər könlüm açılmaz bir nəfəs, cana,
Ləbin ləlinə məhzundur könül, hərçənd xazindür.

Təsəvvür qılma kim, təskindir suzi-dilə əşkim,
Yanar od batinində daş basa suya kamindür.

O gündən bir yükün yüz-göz kirlənmiş ağzın,
Tutulmuşdur dili-pürhəsrətim zira ki, ziyaimdür

Sözümdən incimə, cana, əgərçi qorxuram səndən,
Gözündən səndən artıq qorxuram, çün əhli-batildür.

Sənə  peyvənd edən qət'i-təmə etmək gərək candan,
Sənin eşqinlə aləm tərki, ey bədxu, məkkarindür.

Bəni istərdi ala düşmənim, səndən aman aldı,
Behəmdullah, bən ondan eymənəm, o bəndən eyməndür.

Əgərçi mərdi-xudbini özinə peyvəstə maildür,
Çü görsə öz şəhin tanımaz, əzbəs ki, aqildür.

* * *

Boşandım qeyrdən, leyk intizarımdan degil xali
Ki, daği-sinə hər birisi bir açıq dərdi-dildür.

Behəmdullah özüm hərçənd bir halım qalmadı,
Bu gün bu yer cahilindən cünuni-eşqdür.

Hübab özün görər mövcud, ta vardur gözi bağlu,
Bu sərgərdan bunu görməz ki, çün göz açdı, vasildür.

Sözü mübhəmdir, bədxahü məzmunu degil mübhəm
Ki, xana, cümleyi-aləm, gözünə xun xətti-batildür.

Xəlayiq işlərin müşkil andən, nadan bunu bilməz
Ki, işi özünə düşüb də, onun atəşi müşkildür.

Çü su oldu könül, duydum ki, olmuş eşqinə mənzil
Ki, daim su olan pərgardan əhlinə mənzildür.

Deyə bilməm nə gördüm göz gördü çün gərdi-rüxsarın
Ki, ol bir bəladır bacəmalinə müqabildür.

Bənə bir Xızrdır sərçeşmeyi-heyvan kənarında,
Həqiqətdə əgərçi xətti-səbzi zəhri-qatildür.

Bənə düşməz ki, ağuşum açım ümmidi-vəslinə,
Əgərçi sərvi-qəddi nəş'ədən hər yanə maildür.

* * *

Köksünü aşiq qazar, çün dil məhəbbət kanidür,
Lə'llər bu kan içində cümləgi peykanidür.

Etməmiş ixvan təbiət qəsd hüsnü etiqad,
Pirahəndür şişeyi-meyi-badə Yusif qanıdür.

Yox  miyanda gər desəm yarın miyanından nişan,
Hanı gər vardır demək bu mətləbin bürhanidür.

Şərhi-səbzi-şişədən çıxmaz məgər gül üzlü mey,
Bu zümrüd ilə çağlarsan, cəvahir kanidür.

Həm bəni rüsva edibdür, həm özü olmuş məsəl,
Gərçi manəndi-nigəh lütfi bənə pünhanidür.

Gəzdi çeşmim, oldu çün heyran sənə, rəngim gəzər,
Doğrudur hər ləhzə bir sərgəştənin dövranidür.

Yaş tökər, bağrı yanar var ta vücud bir tək nişan,
Şəm'ə məclis zinəti olmağı kəsri-şanidür.

Yari-bədgöftgusi münhəsirdür şikvəmə,
Söz bənim sözüm, vəli fərman anın fərmanıdür.

* * *

Yoxumsa səbrü taqət, olmasın, heyranlığım vardur,
Xəbər səndən yoxumdur, leyk sərgərdanlığım vardur,

Rəiyyət olmuşam nəfsi-xəbisə, qalmışam aciz,
Əgər olsam müsəllət nəfsimə, sultanlığım vardur.

Heçə almaz bəni ol şuxi-bipərva səlamım tək,
Giranəm özümə ondən, çü bu ərzanlığım vardur.

Sözün, cana, əgər gəldin ola ağız çəkə bilməm,
Zəifəm bu səbəbdən ki, nafərmanlığım vardır.

Gözün bimarı çün pəhriz edüb azü çoxa baxmaz,
Sənə bir quş qanadı mayeyi-mehmanlığım vardur.

Bu damın həlqəsindən baş çıxarmaq çün degil mümkün,
Pəri toruna düşmüş savəyəm, heyranlığım vardur.

Bəni üryan edən əsbabdən sevdayi-eşqindür,
Bəsimdir bu ki, dürri-əşk tək qəltanlığım vardur.

* * *

Mur degil muyi-miyanı, muydən bir ayrıdür,
Ağzı söz sərçeşməsi tək bir görünməz ravidür.

* * *

Çün yandı su cəhandə qəmkari-xəlqdən,
Andan sipəndi-duzəx, ondan məafdür.

* * *

Cəfadur xubrulər şivəsi, hur etməyən olmaz
Ki, can acısı birdür, can əgərçi təb mühəyyadür.

* * *

Yəman xəlqi-xudayə istəyən, əlbəttə, məlumdur,
Rəqibi kəsgilən, cana, çıxarma, onu tabdur.

* * *

Olur üşşaq qədri canfəşanlıq oxuyanda zahir,
Boğazdır, eydi-qurban boğaz, mətləb doğar axir.

* * *

Canı kibi cəfasinə aşıq mədar edər,
Tar gətürsən bu cəfanı ki, yar edər.

* * *

Hübbi-nəbat kibi görər hər ki, yarımı,
Su kibi uymağına sərapa dəhan olur.

* * *

Üftadəlik təlası degil bakü xoşgüvar,
Gər qalxar isə et üşşaqdən qübar.

Gər yarını versə yuxunda verən qərar,
Daşdı, əmma ruyi-seyli-cünun bəndən ixtiyar.

Yusif kibi ki, aldı Züleyxa qərarını,
Seyd etdi eşq böylələri çox tar-mar.

Könlüm qaravü bəxt qaradur və leyk şükr,
Kim, ağdır yüzüm, necə kim çeşmi-intizar.

Üftadəlik təlası degil pakü xoşəyar,
Gər qalxar isə hər üşşaqdin əyar.

Gəldükcə həva nəfəs çü verür sən kibi hübab,
Könlüm nəfəs kibi yeritdin dəmbədəm qübar.

* * *

Olma şüküftə, gər bəni yandırsa dağlar,
Pərvanə gər yanırsa, sönməz çırağlar.

* * *

Ayrı şəm bir dinə hər biri bir pərvanədür,
Könlümün hər yarəsi bir aşiqi dəndanədür.

* * *

Öylə sərməstəm ki, hicranında bilməm şəb nədür,
Ay nədür, ulduz nədür, əncüm nədür, kövkəb nədür.

Ləxti-dil əhvalımı çün yardən aldım, dedi,
Söylədin bir parə sözlər, duymadım mətləb nədür.

Bəhrə Məcnunəm, müəllim oldu seyli-əşkdən,
Oldu kəştiyi-Nuh lövhi-məktəbim, məktəb nədür.

Çeşmi mane oldu seyri-gülşəni-rüxsardən,
Görmüşəm bir çeşmini, bilməm çü ğəbğəb nədür.

Ol əli qanü həna səd parə etmiş bağrımı,
Bağlamış töhmət ləbinə, bu nə sözdür, ləb nədür.

Təb nişandur tabdən, bizə nə təb qalmış, nə tab,
Ey xoş ol Məcnun ki, fərq etmiş ki, tabü təb nədür.

* * *

Bizim şeyxə yəman göz birlə baxma, qədrini bilgil,
Əgərçi şeyxdir zahirdə, batində brəhməndür.

* * *

Kuhkən gər dağı qazarsa, deme zəhmət çəkər,
Çün bu ağır yüki kim, derlər ona şöhrət çəkər.

Müzdsiz cəmalə bənzər can ki, vəsl ümidinə,
Can çəkər, külfət çəkər, zəhmət çəkər, möhnət çəkər.

Möhnəti-hicran bəni əzbəs ki, etmişdir zəif,
Gər çəkərsə əndəlibim, buyi-gül zəhmət çəkər.

Öz dodağını əmər, içməz əgər cami-şərab,
Tifldir şəmşir əgər çəkməz bənə qayət çəkər.

Mən' edər naseh səri-kuyinə getməkdən bəni,
Əgər bilməz ki, huşim aparır, qeyrət çəkər.

Bu nə nazü qəmzədir cism ilə aşiq canına,
Can əgər çəksə qəmdən binəva minnət çəkər.

Eşqi-Şirin bəs ki, Fərhadı səngdəst eyləmiş,
Gər çəkərsə dağı çağlarsa məgər surət çəkər.

Mərdümi-çeşmim nola etdi əgər dildarı ram,
Ömrlərdür qan içər bu binəva, xəlvət çəkər.

Canü ömrüm, rəhm elə axır Vəhidin canına,
Ömrlərdür bu əsiri-binəva zəhmət çəkər.

* * *

Kaş naseh mən'i çün dərdi-eşqim tazələr,
Naməsində həm günahə, həm səvabə yazələr.

Çün hübabi-badeyi-vəslində hicran çəkər,
Var, ləbi-ləlinə göz açmaqlarım xəmyazələr.

Zəf'i-hicran çeşmim etmiş rişteyi-tənbur tək,
Nola çıxa hər nəfəs neydən əgər avazələr.

Bilmənəm, ya Rəbb, nədəndir gözümə girməz yuxu,
Gərçi bağlanmaz şəbi-hicrandə bu dərvazələr.

Səf çəkib vəslində əşkim, mən' edər nəzzarəmi,
Bu uşaqlar göz yolun mümkün degildür azələr.

* * *

Çünki yadi-xətindən xuni-dilim atıludur,
Yürəgim qanın içər yarü dilim, qayğuludur.

Ruzü şəb kuh kibi naləvü fəryad edər,
Bəs ki, səhra yürəgi gərdi-qəmimdən doludur.

Təngnayi-dili gördükdə təəccüb edirəm
Ki, necə bunda sığar, ol ki, cəhan uludur.

Odlayıbdır dilimi, odlamayıbdır dildə,

Ol qəzali-Xütən andan dilim otlu, suludur.

Dağdır qapısıvü dideyi-heyran bacası,
Gəl dilim xanəsinə, bacaludur, qapuludur.

Kisəvü dil ikisi şişeyi-saətdür
Ki, biri xali olan çağda birisi doludur.

* * *

Pəriddir bu səs köksümə ki, kim adı naləmdür,
Bununla çərxə pərvaz eyləmək daim xəyalimdür.

Əritmək, əşk tökmək şəm tək bəzmindədür sə'yim,
Gözüm rövşən ki, nöqsan eyləmək eyni-kəmalimdür.

Xumarın gözləri sındırdı bu badə tək hərgiz,
Əgər öz qanımı bu qüssədən içsəm, həlalımdür.

Nə pərva qeyrdən var nigənban, nə rəqibimdən,
Xəyali-vəsl etmək hicrdə bəzmi-vüsalimdür.

Bəni etmiş zəminü asiman bədeşqü müstəğni,
Fələk dudi-dili-suzan, zəmin gərdi-məlalimdür.

Belə gər ahü əfğan ləşgəri birlə keçər ömrüm,
Fəzayi-asiman səhni-zəmin tək paymalimdür.

Nə ölü, nə diri, nə məsti-layəqəl, nə hüşyarəm,

Nə qəmginəm, nə xəndan yarsız, bilməm nə halimdür.

* * *

Şəbi-hicran diraz olmağını bidar olandan sor,
Səri-zülfün səvadın ruzi qəmdən tar olandan sor.

Ağır təminə yetməz heç ləzizin tamı, bilməzsən,
Bu şəhdi-xar adın dadını bimar olandan sor.

Boğazlatdı bəni bu dövri-bibal, yəni ləbi-ləlin,
Cəfayi-eşqdən canü dili əfkar olandan sor.

Dəhanın qeybi-yarın göftgusi, sirri-qeybidir
Bu sirr tək hikmətini vaqifi-əsrar olandan sor.

Ol dünya tələbdür dağ bir dolu həmyan,
Bu həmyanın şümarın talibi-dinar olandan sor.

Yedi cismimi, amma daği-hicrin gözü dönməz,
Qəbulun gəlməz isə, təşneyi-didar olandan sor.

* * *

Müyəssər gər olursa vəsli-canan, həsrətim artar,
Rüxi-xubinə heyran olmaz isəm, heyrətim artar.

Necə kim, sıfrdan olur rüqumi-həndəsi əfzun,
Bu barani-şirişkimdən qübari-külfətim artar.

Nə tədbir eyləyim səhhətdən olur xun, fuzun dərdim
Ki, bir qıl zəhmətim gər kəm olursa, zəhmətim artar.

Dəxi oddan işimiz hər nə yandı, oldu xakistər,
Tükəndi çünki aramü qərarım, taqətim artar.

Verir heyrəti-didar çün didarə yol tapmaz,
Bənə fürsət nigahi verməyəndə fürsətim artar.

* * *

Şəbi-hicran demə, giryan gözüm dövründə müjgandur
Ki, andan bir-birisi çeşmeyi-pürdür, yayı peykandur.

Yenə nəfsi-İsa olmuş ənfası Məsihanı,
Nədən, ya Rəbb, bənə ol mayeyi-can afəti-candur.

Yuxu quşu gecələr aşiyani-didəmə qonmaz,
Nəsimi-nalədən cismim nihani bəs ki, lərzandur.

Müəlləq şəm kibi ta aşağa salmışam başım,
Yarısı atəşi-suzan sirişkim, yarısı qandur.

Nə hasil gər olub bəxtim müavin nuri-didə vəz
Ki, ol  məhcub özi kibi bəndən girizandur.

Ayağım çəkəndən yol ağacı ərğəvan şaxı,
Olur fərşi-rəhi-canan, əgər xari-müğilandur.

Qubari-türbətim ətfalilə bipavü sər oynar,
Cünun zatı düşəndən sonra dərmanı nə imkandır.

* * *

Bimar çeşmi-dərdini daim bənə verür,
Çün gül ki, aşina olsa, aşina verür.

Bir dil olubdur əksi hər bir dügün bənə,
Tərpəndigimdə yerli-yerindən səda verür.

Çeşmim səni görəndə yaşarmaz ki, mərdümək
Əksin olub qonağı evinə səfa verür.

Giryan görəndə çeşmimi-ruyi-nigarıma,
Ol xətti-səbzrəng çü bərgi-həna verür.

Sinəmdə dərdi-dağına çün çulğaşur fəğan,
Hərçənd bən xamuş olursam, səda verür.

Bir pəhləvan kibi ki, basar bir müslimi,
Rüsva bəni edəndə cəhanə səla verür.

Məyus əgərçi yar bəni etdi vəsldən,
Bir yə'sdür vələyk ki, buyi-riza verür.

Verməz bənə əgərçi muradım fərib ola,
Hərçənd hər gədayə onu bir gəda verür.

Cüz aşiyan bülbüli-şuridə görəydim,
Bir gül bu gülüstanda ki, buyi-vəfa verür.

Əzbəs bəxildür, aparur heyrətim əgər,
Üşşaqə bimüzayiqə ol büt cəfa verür.

Sənsən ki, bir sual edənə vermisən cəvab,
Gər dağ bağrı daşsa, əmma səda verür.

Dil oldu ləxt-ləxt, edər isən əgər sual,
Hər ləxt köksüm içrə cəvabın cüda verür.

Bən zaminəm, Vəhid, nəzər bağla qeyrdən,
Hər mətləbi ki, xatirin istər, Xuda verür.

* * *

İşim əzbəs ki, ahü naləvü fəryadü şivəndür,
Bənimlə dust oldu düşmən, əmma dust düşməndür.

Gözüm …………….. gözdə deyərdi bilməzəm əmma
Ki, ol həm mərdümi-aləm kibi nə mərdü nə zəndür.

Mükəddər oldu yarın kuyi sə'y yetişməzdin,
Bənim can etməgim ol şişeyi-səngi-fəlahimdür.

Nola daim uçar sər gər şərər tudəyə verdin
Ki, bən aşi-xanəmudi-pürxəm yarın bağrı hindudür.

Qubari-qəm çü qondu könlümə, açıldı sərindən,
Dedi bu yer səfalı bir vətən, baği-nişiməndür.

Degildür mehrü  məhdən şəm kibi pərvanə çeşmində,
Könül quşu qonar yer seyrgahü dimaği-gülşəndür.

* * *

Aşiqi-biçarədür hər vəslü hicrindən səmər,
Tər basar vəslündəvü hicrində çeşmim yer kəsər.

Daş bağırlı yarımın könlünə ahım neyləsün,
Daşə daim yel əsər, etməz vəli hərgiz əsər.

Gər gəzərsəm aləmi, zindani-qəmdən çıxmanam,
Şəhrdən etməz səfər, gər aləmi gəzsə xəbər.

Söylə, ömrüm, sən əgər etsən şikayət yardən,
Ol tükənməz sözləri bir hərf ilə qıl müxtəsər.

Tifl qan ağlar, əgər adına eydi düşər,
Xəlq olur düşmən sənə gər eyləsən cəm'i-hünər.

Yox təğafül damidən aşiqlərə rahi-xilas,
Könlümü daim yəman ol yaxşı baxışlı tutar.

Düşmənim dildə əgər derdi gətür səd güc bənə,
Məcmeyi-üşşaqdən canan bəni etmiş nəzər.

Şəm tək yalın qılıc dildarımın təqtəidür,
Özümi hər xubru bir tazə tərzin bəzər.

* * *

Bu xəstə nə şikayət edərsə, qəm öldürər,
Axır əgər sözünü vurmaz, mərdüm öldürər.

Ol mayeyi-həyat berəngi-abi-zindəgi,
Tutsa əgər nəfəs yolun, bir dəm öldürər.

Naseh bənə rəqibdən artıq edər cəfa,
Gər inlədürsə dərd bəni, mərhəm öldürər.

Sultan kibi ki, uçura seydini bir gəda,
Canan bəni rəqibim edərsə, rəm öldürər.

* * *

Yetişmiş bir yemişdir qocalıq ağu kibi acı,
Əgər pərivəş görsən, tamında bəs, sənə bəsdür.

* * *

Necə bilməzsən ki,  bu sərgəştə fərmanındadur,
Can, əgər dil ikisi dəxi sənin yanındadur.

Necə çeşmin eyləsün seyri-gülüstan rüxün,
Bənd çün tari-nigahım, xari-müjganındadur.

Etmənəm inkar ruyin, künci-zülfindədür ilan,
Bu ilanın zəhri əmma şami-hicranındadur.

Azdırıb yoldan çıxarmaq, şöhrə etmək şəhrdə,
Bəni görən, ey məh, bu şeytanlıq ənsabındadur.

Yetməyəcək, bilmənəm nədən küt etmiş çeşmin, Vəhid,
Bu yanar od həsrətindən kim, sənin-canındadur.

* * *

Karvani-növbaharın bisümar əsbabı var,
Laləvü güldən, həririi səbzədən sübhanı var.

Səbzə etmiş xabü mövci-ab, edər təbiri-xab,
Göz açüb nərgis qızarmış şərmdən gülbanı var.

Aşiqi-sərgəştənin abi-rəvan içrə həyat,
Kuydə puşidə əz şərmü dili-bitabı var.

Təşnəlikdən lalə bağrı dağ olursa, qəm yeməz,
Əbri-tərdəsti-bahari kibi bir mirabı var.

Bağ əzbəs gülabından gecələr pürnur olur,
Püşti-divarın güli-rəna kibi məhtabı var.

Bəh çıxarmaz əgindən hərgiz nəməd yapuncusun,
Çün rəgi-əbri-bahar tək min girdabı var.

Doldurub peymaneyi-ömüni, vermiş gül ona,
Bülbül ölməz bu xəcalətdən, əcaib tabı var.

* * *

Yar gedərsə, sənə bir sərvi-xuraman görünür,
Bənə can getməgidür, gər sənə asan görünür.

Qövr edəndən sonra səd parə görərsən yürəgin,
Gözünə qönçə əgər bağda xəndan görünür.

Gəlür əlbəttə giran dağ kibi ayinəsinə,
Sözlü görün sənə bəd çün bilmisən asan görünür.

Bülbülün ləxtə dilindən doludur səhni-çəmən,
Sənə hər tairi-sərməst xoşəlhan görünür.

Bilməsən kim, nə edər canıma bu zahidi-xüşk,
Ol sənə quru əsavü, bənə əyan görünür.

Bənədür göz qarası kibi hamı nurü ziya,
Zülfi-canan sənə küfrü bənə iman görünür.

* * *

Səfheyi-əflak bəndən yarimə bir namədür,

Dil dəvatü xun mədadü dudi-ahim xamədür.

Arzu təsvir edən könüldəki timsalilə,
Surəti bir surətü əndamı bir əndamədür.

Yana-yana şərh edər hali-dili-suzanimi,
Şəm'i-məclis sənə bir sərbəsteyi-namədür.

Parəhayi-dil şərər kibi ki, düşmüş kağıza,
Biri-birini çaparlar, görməli həngamədür.

Xəl'əti-əndamı, muyi-miyani-naziki,
Qəddimə guya ki, bir fərmudeyi çəsban camədür.

* * *

Basılan düşmədən axır düşmənə firuz olur,
Ruz olur şəb, şükrlillah, aqibət ruz olur.

Görünür axır sənə ləxti-dili-sədparəmiz,
Çün üruc etdi gögə, hər biri ulduz olur.

Qızarır hər ki görər kim, yandırubdur könlümü,
Hər şərər bağında töxmi-bustan əfruz olur.

Yar manəndi-şərər hərçənd kudəkdür, vəli
Bir nəfəsdə şöleyi-hüsni cəhanəfruz olur.

Hər nigəhindən edər mürği-dilü çeşmimi ram,

Bir iki gün riştə bərpa dursa, dəstamuz olur.

Çünki yeyərsən …………….. aşiqləri,
Bu səbəbdəndür ki, qəmzən oxları dilduz olur.

Çün olur şami-fəraq, verilür sübhi-vüsal,
Aşiqə hər şəb qiyamət, hər günü novruz olur.

Çünki dərman dərd olmaz, bilmənəm, ya Rəb, nədən,
Xəndəsi könlümə şəkkərbari-sinəduz olur.

* * *

Gülşəni-ənvar çox, könlüm onun nurisidir,
Qətreyi-əşkim dəxi girdab ilə qurisidür.

Getməgi gəlməz çü gəldi külbeyi-əhzanimə,
Cümlə sahib tövrlərdən yar xoş tövrisidür.

Xəlvətimdür dəstü bu hər xəlvətindən yegrağı,
Çadırım sərgəştəlik, bu xeymələr dörtüsüdür.

Uçmağa gəlmiş şərər tək aşiyani-didədən,
Qətreyi-əşkim ki, könül quşunun lövzisidür.

* * *

Olmuş genə möhnət, bənə həmdəm nə düşübdür,
Könlümdən edər eyşü tərəb rəm nə düşübdür.

Eşq odu bənim canıma, iş başıma düşmüş,
Naseh, nə deyirsən, sənə bilməm nə düşübdür.

Öz çəkməgilən bir yerə verməz onu əldən,
Zəxmimlə düşmüş yenə mərhəm nə düşübdür.

Aşiq olanın könlünü, əlbəttə, sevərsən,
Azar çəkərsən, sənə, ey qəm, nə düşübdür.

Salır oda daim özünü bir ərəqi-şərm,
Ta yarıma göz olmaya məhrəm, nə düşübdür.

* * *

Candan qaçaram çün ola həngameyi-məhşər,
Yoxdur dadı hərgah ola pərizadi-mükərrər.

* * *

Heyrət edərəm hər kimə, hər kim verə düşnam,
Bir söz ki, özü eşidə, bilməz necə söylər.

Gər başdan ayaq xatəm almasa tapubdur,
Heç barmağa olmaz kiçik əngüşt bərabər.

Qeyr ruzi mükərrərdür bu türfə ki, vardır,
Hər sözü mükərrər demağı qeyri-mükərrər.

* * *

Heç şüğli dam sayma ki, bütlər bəhanədür,
Çün ənkəbut hər kəs özü damü danədür.

Sayma can seyr seydini, cana, əcaib canidür.
Səni seyd etmiş ki, çeşmin kibi çeşmi fanidür.

Nola çeşmim bir qarıma doğa gər min tifli-əşk,
Əksi-ruyindən iki cani degil, səngi-camidür.

Səveyi-dil kəm degil şahini çeşmi-riyadan,
Torpağı qanlıdür onun, gögi onun qanlıdür.

Yatmamış qamıya bu oxdan min çağlar oxunu,
Bilməmiş naz oxları müjganidən peykanlıdur.

Olmadı kim, çeşmi-eyşim mükəddər olmaya,
Zəhr xəndindən bənə dərdi-dilim dərmanludur.

Çün degildi tişeyi-Fərhad bən tək, yar tək,
Heyrət etmə kuhi-səhradən alar, dananludur.

Nola sunar şəm'i, çün pərvanə oldu dur,
Şamlıdur şəm'ü ol biçarə babi-girmanludur.

* * *

Qasidi bir xəstəxanə Xızrdan birun gəlür,

Könlümə yəni ki, dərdi günbəgün əfzun gəlür.

Həddən artıq tifllər bidaddır təkəllümə,
Səngi-baran səni bu viranəyə daşqun gəlür.

Dağdan dil laləzar olmuşdur ara aləmə,
Gül budağından, səba, keçmə ki, buyi-xun gəlür.

* * *

Gözəllərə vari bir naleyi-şətanə yetər,
Həzar sərxoşa bir beyti-aşiqanə yetər.

Zülali-vəsl gəlür, yar gər sevərsə bəni
Ki, ab olmağiçün mumə bir zəbanə yetər.

Bu natəvanə, nigara, düşərsə gər nigəhin,
Desin ki, məstəmü layəqələm, bəhanə yetər.

Verir füruğ sənə hər nə sərf olur bəndən,
Xəyal eyləmə, bir sud bu ziyanə yetər.

Gər istəsən çıxa bu zar natəvan dərindən,
Qaşın işarəsi olsa, yarə ta nə yetər.

İnanmasan ki, dilim ləxt-ləxtdir qəmdən,
Güvah halinə əşk danə-danə yetər.

* * *

Ol yaxşı yüzlü hər kimi tutdu, yəman tutar,
Rəngi-nəzarəmi öylə tutdu ki, qan tutar.

Dil tutdu mənzil ol müjdə kibi kuyi-əndəlib,
Gülşəndə xari-xüşk içində aşiyan tutar.

Ol görüşdə yar bəni etdi büryan,
Düşmən kibi ki, düşmən olandan zəban tutar.

Bən bilmənəm biganə keçər, çün keçər, vəli
Canan düçar olanda bənə cismü can tutar.

Şümşad səbz etdi taraq, bizi dərdəsər,
Bilməz çü ürəyini əli eymən ilan tutar.

Getməz bu bir didəsidən əksi ol gözəl,
Peyvəstə qarlı dağ ətəgində məkan tutar.

Tutmaz əziz canımı, əlbəttə, bir çöpə,
Sən kibi hər ki, o bir büti-namehriban tutar.

Könlüm mükəddər oldu xəyalati-vəsldən,
Bir su kibi ki, üstündə ca karvan tutar.

Qoymaz birisi göz aça əzbəs ki, cövr edər,
Özüni çün ucaldı qübar asiman tutar.

* * *

Mari-insan səfheyi rüxsarı Quran oxulur,
Xətləri sayında xətti-səbzi reyhan oxulur.

Səb'eyi-səyyarə cananı təşbih eylərəm,
Necə kim, yeddi rəvayət birlə Quran oxulur.

Sərnəviştim mövci-əbri kibi naxandədir, vəli
Məktəbi-ətfaldə düşvarım asan oxulur.

Könlümü atəşkədə mən həm könlümün vüsalından,
Nola getsəm, çün lütf bizə mehman oxulur.

* * *

Bu könül çahi-zənəxdə ləblərin mehmanıdur,
Dersəm bir gün çağlarsan ki, adəm canıdur.

Tiri-cövründən gözümdən lalə-lalə qan damar,
Damənim səhni çəmən, bu lalələr peykanıdur.

Xəlq xoşdur könlü şişmiş binəvalər çarəsi,
Mu miyanı kim bizə nəf' etməyə, insanidür.

Ol tuğ ağzun bənə gər bir iş mümkün ola,
Sevdiyim, bu dərdi-bidərman bunun dərmanıdur.

Etməgil, cana, təəccüb gər qərarsam sinəmi,
Yadi-löbətin dildə köksüm cəvahir kamıdur.

Güni gəlməz kim, kəlmeyi-tifl sirişkim didəyə,
Yadi-ruyin, sevdigim, guya könül mehmanıdur.

Xaki-rahidir məni-ləbtəşneyi-abi-həyat,
Sən pərisən, əksi-rüxsarın güvarın nişanıdur.

* * *

Kuhən dünya bir özgə surətə hər gün müsəvvərdür,
Ədəb kibi mükərrər çün olur, qeyri-mükərrərdür.

Hünər ikirdir, bir sər ustad, bir karı
Ki, töfrağı avuclar, bir ucu əşcər, bir ücü zərdür.

Xəyali-xameyi-nəqqaş tək, ey surəti-bican,
Çü məvaidimin kuhi-qəmini çəkmək müqərrərdür.

Təəccüb eylərəm viranə bir həsrəti-dildən
Ki, baqi qalmamış ondan nişan, əmma müsəvvərdür.

Verür ləb xəndəsi can, can alur xəndeyi-aşinami,
Bu ağu çeşmi sərçeşmeyi-canbəxşi-kövsərdür.

Çıxar olsan Süleyman tacı üzrə, səydür bica,
Əgər qismət sənə bir qətrə su manəndi-gövhərdür.

Burax əldən səfanı, güzgüyə bax, gör nələr görmüş
Ki, bir nadim bərabər şəxsilə hər dəm bərabərdür.

Degil məsdud mehman özünə viranə … hərgiz,
Bizim ayineyi-rövşən kibi divarımız dərdür.

Nə görmüşdür gözəllər bu dili-viranədən, ya Rəb,
Gülüstani-füzunə bənzər ki, məktəblərdə əbtərdür.

Həzər qıl püxtəlikdən, pişmə, gör kim, pişməmiş sağər,
Əgər sənə günəh başdan gəlü, islahə sağərdür.

Deyərlər bilməmiş zadlar bizə tərif edər yarın,
Ona əksük nəzər bigöftgu buəmri-münkərdür.

* * *

Bir səri-mu çağımla eşqimi çövrun kəm edər,
İsti qanım zəxmeyi-peykanım mərhəm edər.

Bən pozulmuş mumi-şan kibi sərapa didəyəm,
Sərbəsər çeşmimi eşqin dideyi-pürnəm edər.

* * *

Qəmindən bildi könlümü əşkim axar həman,
Bu biqəş hübabı gör ki, gözdən dolu gəlür.

* * *

Alıcı gözlərin laçını birinə etsə çağıdur,

Könül əhli-qılıc qarlanquşun kimi biçağıdur.

Xoşam gər nəqdi-ömrüm vəsl təhsilidə sərf oldu,
Bu mənidən ki, gəlmiş dərd fazil sormağıdur.

Könüllər, ey səba, məhrəmligindən biqərar olmuş,
Dolaşma, dəgmə zülfi-yarə, bu quşlar bəyağıdur.

Sorursan gər xəbər cənnət bu cani-qeyd fərqindən,
Qucaqda olsa gər canan, qucaq cənnət bucağıdur.

Ağzın yandan açmış, dil çıxarmış yar vəslinə,
Əgər bidi-mur yarpağı gər gül budağıdur.

Nəm əksükdür söləmədədür minayi-dil məmlöv,
Gecə-gündüz durub qarşımda yadi-yar çaqidür.

Degil mümkün aradə sinəmə axır dili çakim,
Çəküb verməzlər əldən xublar, şöhrət çanağidür.

Olubdur gərmi-bazi tiğbaz əbruyi-canan,
Çəkərsən başı arayə, gərdən biçarə haqidür.

Nihani lütfdür kim, aşkara can alur bəndən,
Bənə ziri-rikabi tiği-pünhan görülmağidür.

Bunu bilməz ki, ol hər yerdə də məşuq bülbüldür,
Yanında qönçəni gül haqlamış kim, qol çomağıdür.

* * *

Kəvakib eyşi etmək çərxi əfğan etdigimdəndür,
Könül xaki-sərin, yəni pərişan etdigimdəndür.

Gər üz döndərmənəm kuyində mövci-qiymədən, cana,
Səni görgəc xəyali-abi-heyvan etdigimdəndür.

Əgər bülbül olub pərvanə üz döndərdi şəm'indən,
Sirişkimdən cəhanı bağü bustan etdigimdəndür.

Ələm gər olsa şəm'i-bəzm tək atəş dərunimdən,
Ləbin yadından əxkər dildə nihan etdigimdəndür.

Sayıqlar gözlərini ta dili-biçarə yad etmiş,
Bu bixodluq xəyali-bəzmi-məstan etdigimdəndür.

Könül şuri əgər qıldı bəni-sərgəştəni Məcnun,
Şərabi-eşqinə sağər nəməkdan etdigimdəndür.

Olub su Kuhkən timsalı olmaq şərmdən pünhan,
Yer içrə dağı əfğan ilə viran etdigimdəndür.

Tökərsə rəngini yarpağı tək gül səhni-gülşəndə,
Hədisi-yar edüb seyri-gülüstan etdigimdəndür.

Çırağan etmişəm gər ləxti-dildən şami-hicranı,
Vəhidi-binəvayə lütfü ehsan etdigimdəndür.

* * *

Yüzində zahidin bu suyi-mövci-buriyadəndür,
Ələm xəlqinin arasında əsadandur, rədadəndür.

İki əl çün bir oldu, bir əli labüd dur eylərlər,
Qəvi sərpəncəsi sərpənceyi-zəngi-həvadəndür.

Yumaq birlə bu nükhət çünki getməz əldən, ey zahid,
Sənə gər qoymaz isəm dəsti-ru, buyi-riyadəndür.

Qəzadan yüz çevirmək küfrdür, gər etiqadın var,
Peyənbər kibi həqdür, çün gələn işlər Xudadəndür.

Bəni-sərgəştəyə gərgi-vücudum səngi-rah olmuş,
Xəmiri-tinətəm,guya qubari-asiyadəndür.

Könül, gər xirqə qeymiş daği-eşqimdən xəbər sorma,
Buna dəgmə, dolaşma, bu səbəq əhli-duadəndür.

Vüzu qanilə tutmaqdur, təyəmmüm eyləmək bunda,
Qubari-xatiri-üşşaq xaki-Kərbəladəndür.

* * *

Hərçənd dil tilismi-qəmi-bikəranədür,
Sındır desəm, yenə sölə bunlar bəhanədür.

Hər yerdə kim dəmağ olur, tər könül qonar,
Hər xarü xüşk bülbülə bir aşiyanədür.

Məzmunidür bu kim, edə gör xəlqdən kənar,
Məcnun hədisi mən dedigüm bir fəsanədür.

Var dudman hüsndən ol şəm'i-yadigar,
Min xar hasili bu bu nihali-yeganədür.

Çün bəstə-bəstə şərm alub vəsldən gözüm,
Şani-əsəl kibi ürəgim xanə-xanədür.

Bir müşti-xarə bağlama dil əndəlib tək,
Bu dam həlqəsinə demə aşiyanədür.

Məyus olma şam gər oldu, səhər gəlür,
İşlər əcəb degil ki, dolanə, zəmanədür.

Birdür çırağ, leyk çırağan görər gözün,
Dünya bənim gözümdə bir ayinəxanədür.

Sındır xumarını, çü doldurdu gül qədəh,
Çək badə, tövbədən demə, bunlar bəhanədür.

Et zinhar nəqli-mükərrərdən ehtiraz,
Nüşxar edən sözün dəvə tək hərzəxanədür.

* * *

Vəhşət edəndə gög gözi zəhri-küşəndədür,
Yatmış gögərti içrə bu ahu rəməndədür.

Yox çeşmdaştım ki, bənə lütfün baxa,
Hər göz açub bənə baxışı zəhri-xəndədür.

Çeşmi seyr edəndə bəni kəsdi kiprigi,
Bu quşların bıçağı əcaib bürəndədür.

Görməm cəmalini yüzündən, çün çəkər niqab,
Gəzməz çü heyrət eylədi gözüm, bu gəzəndədür.

Rəngim o hində almaz onu alıcı gözü,
Sınmış qanad ilən nə əcaib nizədür.

Qoygil bəni ki, ruzi-siyahimə bağlanım,
Aşıq gülərsə zəxm kibi dərdi-xəndədür.

Daxi məhaldur görə asudəlik yüzi,
Hər tar uçar gözün damarı tək cəhəndədür.

Məşuqə göz o tarü ağı tanıdı bəni təmam,
Göz şəm tək imiş, bəni çeşmim xürəndədür.

* * *

Şəm oduna yanmış bir pərvanə düşübdür,
Bu yari-nəzər gərdişi mərdanə düşübdür.

Peymaneyi-mey çün gecə oldu bərməla nuri-mey,
Vəsfi bu gədanın nə mülükanə düşübdür.

Yandırdı bənim fikrimə, hərgah ki, düşdü,
Atəş kibi yarım dəlü divanə düşübdür.

* * *

Hər kim cəhanı tərk edübən eşqi atəş tutar,
Canı əgər gedərsə, bu işə gəliş tutar.

Hər kim ki, səni gördü, dəxi görmədi özün,
Avulmaz tək gözünü …  ummuş tutar.

Sancar nəvayi-ney bəni, bən dilgüzidəyəm,
Biri tutar ilan onu, biri qəmiş tutar.

Könlü qalıb şükufə kibi, eyləməz səfər,
Hər kim bu gülşənin səmərini yemiş tutar.

Bina olur şükufə kibi arifin kövsəri,
Könlümü bağlıda bükən bağlamış tutar.

* * *

Pəhluyi-hilal kibi özündən təhi edən,
Hər yerdə var müşarileyhü yeganədür.

Mu degil muyi-miyanı, muydən yaradur,
Ağzı sönməz çeşməsi tək bir görünməz nurludur.

* * *

Dedin ki, könül ol Məsihə dəgməz bədənsiz,
Dedim ki, söz dəgəndə ona bisüxənsiz.

Bülbül fəğanı kibi səda bağə çulqaşur,
Səndən zebəs ki, rəngi-güli-yasəmənsiz.

* * *

Ey xəcil, kövsəri-ləbdən şireyi-cansan məgər?
Can imiş Allah şiri, munca canansan məgər?

Can verərsən İsayi-Məryəm tək aşiqlərə,
Ey qiyamət xasiyətli, abi-heyvansan məgər?

Yar zülfisən, dilim varmaz deyəm bidadini,
Yetmədin payanə hərgiz, şami-hicransan məgər?

Canü dildən eşqinə etdim fəda canü dili,
Getdi canım birlə mehrin, dinü imansan məgər?

Dağdan könlümü, ey bədxu, gülüstan eylədim,
Gülmədin, açılmadın, bu evdə mehmansan məgər?

Gecəli-gündüzlü bir dəm xabü rahət görmədin,
Ol pəri hüsninə, ey ayinə, heyransan məgər?

Bir çöpə fəğfurü xaqanı saymazsan, Vəhid,

Xakrubi-astani-şahi-İransan məgər?

* * *

Qüsseyi-nəqlü xuni-dil meyi-cövri-gərdun saqidür,
Rəhm əgər etsən bizə, cana, mürüvvət çağidür.

Çərxi bərpadır, edər ta bəndəlk xəlqi-cəhan,
Bəndəlik tövqi budurmu, çeşmənin hasarıdür.

Dövlətin dərdi-sərindən, ey ki, ağlarsan müdam,
Neyləyə ta canına  zəhri, çünki toprağıdür.

Gecəli-gündüzlü sancır çərxi-gərdan mar tək,
Zəhrsiz olmaz cəhanın gər qara, gər ağıdür.

Açılır hicranda ruzi-vəsli canan, bağlanır,
Bu Vəhidin dili guya yari-duni, baqidür.

* * *

Sorsa bülhəvəs cananı, canani-bülhəvəs neylər?
Məgəs şəhdi sorsa, şəhdi-canpərvər məgəs neylər?

Ayağdan düşmüşəm mina kibi, simbər könül qəmdən,
Çü fəryad eylədi bu binəva, fəryadrəs neylər?

Olur bigüftəgü məlum şəm'i-məclis əhvalı,
Açıldı çün zəbani-şikvələr, ey şux, səs neylər?

Gəzər könlümdə yadi-çeşmi-məstin, sevdigim, daim,
Bu viranda nə istər müniri-şəb, bunda əsəs  neylər?

Könül zindanının müsahibi olmaz balü pər açmaq,
Müqəyyəd yarına pərvanə tək olan qəfəs neylər?

Dedim bikəsligim barı bənimlə  mehriban etsin,
Çü andan dəxi bir iş bitmədi, biçarə kəs neylər?

Bəni axır könül atmağı rüsvayi-cəhan etdi,
Bu bitabi yolunda gör çəng bilməz, cərəs neylər?

* * *

Şikvə etmə, gər müvafiq gəzirsə ruzigar,
Yaxşılardan bu peyman könüllər qalıbdır yadigar.

Kəs təvəqqe süflədən, çün payəsi oldu bülənd,
Göz yumarlar xakdən, çün qalxar olursa qübar.

Yüz çevrinə çağda çün sancar isə mur tək,
İmdi gər bal qaldırarsa, etməli onu zəhri-mar.

Qeyddən çıx tarü mar et cameyi-nasutunu,
Nişi-əqrəbir çü budu bu libasın tarü mar.

Eyşü işrət qapısını özünə məsdud qıl,
Əlindədür çün kölgə açsa ağzını Zülfiqar.

* * *

Çəkmə bu dərdi könüldən, bu yegani çək çıxar,
Mey çəkəndə özgəsi çün sən çəkərsən intizar.

Olmasın gər zibi-zahir batinin məmur qıl,
Guşdə bir yaxşı söz yegrəg ki, dürri-şahvar.

Guşvarın filməsəl gər şəbçırağİ-zöhrədür,
Çün həman sözlər kibi anı qulağından çıxar.

Çün gədayi-binəva kim, qalmış ola şamsız,
Daima xatir pərişandır qəni maldar.

Maldarın gül kibi çıxmaz əlindən xurdəsi,
Gər gülün yarpağı tək dırnağını dövran tökər.

Fərq şeir arasidə vardur zəmin ta asiman,
Bir şeirə biri dəğməz, biridür şeri-şüar.

Özünü heç kimsədən heç kimsə bilməz azraq,
Gərçi palanduz düzər düzdügün, muzdunu umar.

Gərçi düzməkdir ikisi dəxi, əmma fərqi var,
Riştəyə çəkmək, kəhrəba qatırı etmək qatar.

* * *

Əhli-kərəm sözü hər birisi bir kitab olur,
Derdim deyəndə bin sözə bir söz cəvab olur.

Naçar edər cəlayi-vətən cövri-çərxdən,
Divani-şerdən biri çün intixab olur.

Xəttin hesab, həndəsə çün eylədi rəqəm,
Bir qıl başiçə cövr edər, bəs hesab olur.

Bu dil didələrini ki, gəlmiş giran sənə,
Gahi şərabi-nab sənə, gəh kəbab olur,

Yığlatma çün dedim məni, canan gülüb dedi:
Aşıq ki, qanlı yaş tökə, aləm xərab olur.

Gər nəqşi-səng kibi ola dildə eşqi-yar,
Cövrün çü ab eylədi, nəqşi-ab olur.

Canan dedi ki, şəm kibi niri-didəsən,
Könlüm yanıb həmişə bu sözdən kəbab olur.

Dil yar canibindən olur oldu çün xərab,
Məktub özinə yarə çü aldı cəvab olur.

Ayinə kibi bəs ki, nəzakət siriştdür,
Çəksəm əgər nəfəs, aramızda hicab olur.

* * *

Rüxi-pürnurini xurşid görərsə, bulaşur,
Bəs ki, göz pərtövi-xurşid rüxündən qayaşur.

Necə kim bərq vurur qarəyə daim özünü,
Bəni səndən savuşur, çün bənə yetdi, savaşur.

Necə kim, rənginə hər rəngi-libas olsa düşər,
Sənə, qurbanın olum, hər nə elərsən yaraşur.

Dərdü dərman-ikisi həm bənə olmuş düşmən,
İt-itinən dalaşur, qurdu görər, arxalaşur.

Mur degil muyi-miyanı, muydən bir ayrıdur,
Ağzı münəvvər bir çeşməsi tək bir görünməz oddur.

* * *

Bu xunpərvər çiçəklər mədəni qəlbi-həzinimdir,
Bilürsən ulduzu görgəc ki, gərdun xuşə xəsmdür.

* * *

Mükərrər tək olur hər kimsə oldu əvəz peyda,
Güman etmiş bənim tək bir qulu vardur, yəqinimdür.

Bənəm Fərhadi-vəqtü göftguyi əsli-Şirinim,
Kəsən dağım qübari-xatiri-ənduhginimdür.

Muradım, məqsədim, kami-dilim, mətlubi-mənzurim,
Gözüm, ruhum, rəvanım, dadlı canım, nazəninimdür.

Degülsən böylə kim, ol bir bilən var, nədən, cana,
Eşitmiş, anlamış, təhqiq edib tutmuş, yəqinimdür.

Xəti-səbzi, rüxi-xubi, cəmali-aləməfruzi,
Behişti-cavidan, bağİ-cinan, xüldi-bərinimdür.

Çü bisməl dəstü pa etməkdür əl vurmaq, ayaq vurmaq,
Bəni-miskinə edən bu xəm qaməti-kəminimdür.

Çü xəm əzəm, çü xəm vardım qəmi-eşqində, ey bədxu,
Qərarü səbrü dərdü möhnəti-cani-həzinimdür.

Bəni  kəmnamlıq məşhuri-aləm etdi ənqa tək,
Nigin nəqşi kibi qədim var, nəqşi-niginimdür.

* * *

Vəfa derlər təriqi-yarə, bilməm bacəfa derlər,
Və leykən Kəbeyi-kuyinə dəşti-Kərbəla derlər.

Nə dil qoydu, nə can, nə səbr, nə iman, nə taqət,
Nikulər rəhbərinə guya nigahi-aşina derlər.

Əgərnə hər könüldən həqqə bir yol varidən, ya Rəb,
Gədayə hər nə dersən, dad edər rahi-Xuda derlər.

Yetə bilməz sənə bən xodkiməm, rəngim uçar quşu,
Zebəs təmkin əgərçi cilvənə nivşü nüma derlər.

Yeri hamı-padşahların önündə söylənür daim,
Vəli gülsən, çü səni nami-Xuda, nami-Xuda derlər.

Çü daği-tazə aşiqlər dilini yenə damən etmiş,
Nüktə tək sözlərini ərz edəndə, bisəda derlər.

Bənə hər kirpigi yarın bir əngüşti-işarətdür,
Nihani sözini gözləri bir-bir cüda derlər.

Ey ki, … sayılır təslimi-meydani-şəhadətdə,
Vurursa bal, pər bisməl edübdür, dəstü pa derlər.

* * *

Çünbüli-zülfi nəsimi-sübhdən çün açılur,
Tari-pudim zülfi tək biri-birindən dağılur.

Ol dəhani-dərdi-dil üşşaqə dərmandür, vəli
Bu dəvanın adı var, ərzaq nişanı sayılur.

Yar dərdi, ey könül, girsə ələ, baş urulur,
Yusifi-Misri kibi bu hüsn nadir satılur.

Girməz imiş yar vəsli səy ilə guya ələ,
Heç yerə yetməz könül, hərçənd artıq atılur.

Görmüşüz fəthin qapısını kəlidi-əcz açar,
Quş kibi avın basar, hər kim, av basılur.

Könlümün qanın tökər, qaşinə kirpik kibi,
Bir-birinə bu zəif üstə qılıclar taxılur.

Zahid istərsə … ola, mey çəkmək gərək,
Badiyə həmrəng olur, çün badəyə su qatılur.

Sərxoş olursa ləbindən, busəsindən kəs təmə,
Sağəri-güldə olan meygirdən ərzaq olur.

Çəkmə bənə bin şiddətin, naseh, incitmə özün,
Su olub su dilimdən öz-özinə açılur.

Göz götürməz mehri-aləmtabi-xaki-zahidan,
Hər ki, xaki-rah olur, halinə axır baxılur.

* * *

Əgərçi gözləri bimardur, aya səbağə bənzər,
Gözi ayinədə görmək məriz görməgə bənzər.

Sanursan pərtövi-rüxsari-aləmtab, cana, nədür,
Xoşa xaki-gülün bülbül üzündin yegrağə bənzər.

Ana mümkün degil hərgiz güşadi-üqdeyi-xatir,
Qocalmış münhəni adəm dirilmiş dırnağə bənzər.

Bilürlər kim, könül xəşmindən ol məhcub nihandur,
Deyər ölsəm təsəvvür qıldım anı iqrağə bənzər.

Əgər əhli-mə'nəm, mey keyfdən hər ləhzə məzurəm
Ki, bixud oldu qəm, səbhan onu görmağə bənzər.

* * *

Səfər hər yanə etsən, fəthü nüsrət həminanındur,
Məkan hər yerdə tutsan, hifzi-pasiban məkanındur.

Mübarək xatir gər istərsə səri-qeybdən,
Behəmdullah ki, ilhami-ilahi həmzəbanındur.

Pənahın lütfi-hə'qdir, dideyi-dövran nigəhbanın,
Duayi-mərdüm ruyi-zəmin təvizi-canındur.

Bənəm zamin, ərusi-dəhr səndən qeyrini-sevməz,
Yəqin hasil olur Həq lütfidən hər kim gümanındur.

Süleymansan, qanadlı quş dili dövranların, şaha,
Yeri şəkər gözəllər başı, fərşi-asimanındur.

* * *

Etmə bavər kim, həmin yoldaşların səndən qaçar,
Vari zadın, dövlətin çün qaçdı, aradan qaçar.

Ruz kibi kim, kur çeşmi görə bilməz şəbi,
Qaravaşın gər var isə, bir gün qardaşdan qaçar.

Oxi kim çeşmində verdin pərvəriş çün nuri-çeşm,
Olmaya bir gün çü ruzi-dövlətin, rəvişdən qaçar.

Ol ki, xanından çətin tək qovmaq mümkün degil,
Dövlətin bazarı çün oldu xunək, səndən qaçar.

Yegdür ol kərkəs ki, hərisdən qonar leş üstünə,
Bir günidən kim yəman günlərdə yoldaşdən qaçar,

Mərddür namərd çün çıxmaqda ondan incimə,
Bu yəmandur kim, yəman günlərdə səndən zən qaçar.

Özinə böylə güni istə, ruzi-fəth bil,
Çünki bu günlərdə səndən zən qaçar.

* * *

Aşiq olsan mayeyi-candır, nəfs şivən çıxar,
Rəhnümayi-əqli-rahi-eşqdən rəhzən çıxar.

Dudi-ahimdən həzər qıl, çox sitəm etmə bənə,
Bir tütünlü ulu söz nagah ağzımdan çıxar.

Gərçi biqədrəm, ayaq altında pamaləm, vəli,
Xaki-gülşən kibi bəndən hər nə istərsən çıxar.

Gövhəri-yekdanədür bu dil dəruni-sinədə,
Gər edərsən tərbiyət, bu danədən xərmən çıxar.

Hər kimi kim, özün eyləsən, dust çağlarsan, Vəhid,
Yaxşı görsən çün yəman gündə onu, düşmən çıxar.

* * *

Gər uğrasa bidərd ələmə dərdir,
Dərd əhli əkərsə, o da sərvdir.

Məcnun dili tutmaz şövqdən səhradə,
Yarın çağırıb ballı vagərddir.

* * *

Bəxtim ki qaralmış, rüxi-nuranın üçündür,
Ahım ki, alışmış, şəbi-hicranın üçündür.

Dil qönçə kibi parələrəni yuduğunda,
Gər cəm eləmiş zülfi-pərişanın üçündür.

Bir tükdən əgər bu dili xungəştə açılmış,
Muyi-kəmərü çahi-zənəxdanın üçündür.

Bazari-qiyamət həsrətin alsa ümidim,
Nayab olan dəhrə dərmanın üçündür.

Fərhad kibi önümi etdi bənə Şirin,
Bu şuri-qiyamət ki, nəməkdanın üçündür.

* * *

Rişteyi-cana çü tari-zülfi-canan sarmaşur,
Vəsli-yarə xahişim çün eşqi-bican sarmaşur.

Zöhdi-xuşkim bir ağac tək kim, düşər ol xanına,
Sarmaşur cananimə, əmma girizan sarmaşur.

Qeyr ilə sarmaşma, cana, sayma qeyri mən kibi,
Sarmaşur ol həm sənə, ey namüsəlman, sarmaşur.

Sarmaşur çün tari-zülfün, ey pəriru, canıma,
Rişteyi-can o nigara dinü iman sarmaşur.

Bu nə sözdür, könüllərdən gəlür asan gecə,
Seyl tək viranəyə çün etdi tüğyan sarmaşur.

Zöhdümə baxma ki, etmiş cismimi muyin kibi,
Yarıma yarım ola, gər binigəhban sarmaşur.

Qəddimi xəm gərçi etdi cövrün, əmma zamanın,
Başı üçün sərvinə yetdikcə asan sarmaşur.

Rişteyi-tari-həyat-bən bisərvi-qədi-tam,
Sarmaşur, əlbəttə, ey türkizəbanan, sarmaşur.

* * *

Bənə bir iltimasçı ol cəvan vəslinə hazırdür,
Sürahinin əgilmiş yarıma məzmuni zahirdür.

Çəkər gül kibi hər ləb xəndəsi bir elə nəməkdən,
Gülər üzümə gər böylə canan, ömrüm axırdür.

Dedi canan görünməz uğruna aşiq, nədən oldun,
Dedim heç dinmə, bu sərnigundan kim əcəb sirdür.

Yumar sənlən gözü, çünki oldu aşiq olması,
Bəli, bəni tar tək gərəkdür bağlaya, hər kim müsafirdür.

Dəhanın çeşmi vəqti-tişələrdən gərçi asandır,
Behəmdullah, degil nihan, nihan olduğu zahirdür.

Əgərçi peşəsi qan tökmək isə müttəsil yarın,
Behəmdullah ki, aşıq çeşmi tək damanı tahirdür.

Əgər istərsə hüsni-yarımı vəsf eyləyə vasif,
Qəsirdür təb'i, məni doğmağından … qasirdür.

Əgər aludə etsə didə bəni özgəyə baxmaq,
Yuvar göz yaşın çeşmi hər kim ki, zahirdür.

Tənuri-dildə vardur eşq, ondan əkmək yetişmiş,
Gözün tək göz suyilə bu dəgirman ta ki, dayirdür.

* * *

Gül üzlü novbaharın kəndi-kəndidən şeyxü şab oynar,
Oxur gülşəndə sular, əl çalar mövcü hübab oynar.

Bənəfşə qamətü cism birlə bəzmi-eyşi-gülşəndə
Tutub başdan igidlik eyləmiş muyin xizab oynar.

Özün zəbt eyləməz dil, çün xuraman gördü dildarı,
Bəli, seylabi-sərməstanə çün gəldi, xərab oynar.

Necə kim, bərgi-gül oynar, əsir çün badi-novruzi,
Çü şəh etdim fəğan, vari ol tərəf niqab oynar.

Qərabətdən könül çün gərmdür, əlbəttə qan qaynar,
Rüxi-xubin görəndə bərgi-gül içrə gülab oynar.

Çəkim çün naleyi-dildən, çeşmi-giryandan töküm,
Əgərçi tutulur gün çeşməsi, əmma səhab oynar.

Nəsimi-eşqdən bibəhrə düşmüş zöhdi-xüşk, əmma,
Görüb bazari-eyşi gərm, çün mövc sərab oynar.

Çıxıbdır qönçeyi-gül şərmdən ləb xəndəyə açmış,
Tutub sağər çəkibdür mey, olubdur bihicab oynar.

Əgərçi səbzə yatmış mövcdən, peyvəstə rəqsandur,
Yuxuda tifli-baziquş hərgah etsə xab, oynar.

* * *

Bənə əzbəs ki, bu nazik miyanlar təng tutmuşlar,
Özündən filməsəl hərgəh ki, qaçmış, rəng tutmuşlar.

Gözüm dövründəkini kim görərsən, sayma müjgandur,
Nigəhlərdür ki, əşkimdən çəküb həmrəng tutmuşlar.

Degil məktəb və leykən ləxti-dil tifli-dəbistan tək,
Cüda hər parəsi sinəmdə bir ahəng tutmuşlar.

Yerindən üzv çün oynar, fərağın dərdinə uğrar,
Cüdalıq gərçi bir qıl başıdır, fərsəng tutmuşlar.

Sənin küyindəki bədnamlər kim, eşq edüb rüsva,
Oxumuş əql dərsin, arü namı səng tutmuşlar.

Qulaqlar güşvarı cümləgi gülbangü vəhdətdür,
Müxalif tarlər gör cümlə bir ahəng tutmuşlar.

İki yüzdən sipahi-hüsn cövlangah yazanda,
Xətindən bağlamış tərkiş, təriqi-cəng tutmuşlar.

Könüllər quşu gər bismil olan çağda bitəmsil,
Bunu eyb olanlara manəndi üzr ləng tutmuşlar.

Libas rəngini gül geyməmiş, hərgiz belə cinan
Əcaib üzlərinə xubrulər səng tutmuşlar.

* * *

Könlüm evin kəsən gecə yarın xəyalidür,
Gül rəngi tək qaçaqi onun gül cəmalidür.

Bağİ-cəmali-dilkeşi ta eyləmiş bahar,
Gül kibi yar güzgüsi nişvü nümalidür.

Təkrari etdi xameyi-nəqqaş tək dilim,
Hər tari-zülfi vəsfi bənə şeir-halidür.

Biixtiyar məst kibi hər yerə düşər,
Dildarımın nigahi əcəb laübalidür.

Tabağ qapısından ona göz yetişməyə,
Heykəlli şaxi-gül qolu boynu dualidür.

Yarə-yarəli səfi-müjganə çapar,
Ərqun dili-şikəstə əcaib məlalidür.

Çün badə ixtilatı bəni bişüur edər,
Əldən buraxmanam onu, yarın misalidür.

Örtər gedib çıxar yüzinə, özünü bilməz,
Məşuq güzgüsi kibi könlüm cilalidür.

Fikri budur ki, yarım edə gülşənə güzar,
Canan yolunda qönçə işi guşmalidür.

Bəndən küsüb dilim dəxi saymaz məni heçə,
Dildarımın qılıcına oxşar, hilalidür.

Güllər qulaq açıb, yola sünbül salıb kilid,

Məşuq intizardə bağın vəfalidür.

Çüz  sərvi-qədi-yarinə dil bağlamaz, Vəhid,
Gülzarə iltifat eləməz, təb'i alidür.

* * *

Hər kim yetirdi atəşə, xarı alışdırır,
Hər kim gətirdi yarı, bənimlən barışdırır.

Gər aşti sözü düşə bica, savaş qoyar,
Püf aşı savurur, odu artıq alışdırır.

Dövlət çırağı tək odu düşmən siriştinə,
Düşmən çırağın genə çaxmaq çaxışdırır.

* * *

Kəmali-eşq hər divanəni sahib kəmal eylər,
Yeməz tək hərami, özünə bişəkk həlal eylər.

Dolanə-dolanə halın deyər məstanə-məstanə,
Kəbutər kibi aşiq yarını hazır xəyal eylər.

Düşər oxlar məəttəl çün kəman oxdan füzun düşdü,
Səmən təqrirdən oldu, çü əfzun dili lal eylər.

Güman eylər ki, vəslin istəmiş, yazuq olur qəmdən,

Görər hər kimi aşiq kim, təmənnayi-məhal eylər.

Özün öldürmə qəmdən, tökməmişdir kimsənin qanın,
İnanma sözünə, əlbəttə, ey dil, rəngi al eylər.

Demə, ya Rəb, yetər, biçarə aşiq məst olur qəmdən,
Məzacında meyi-safi olan gərdi-məlal eylər.

Görər olmuş ayağını əgər cismim kibi rəngin,
Degil rəngi-həna, gül şəhrini paymal eylər.

Vəhidi-binəva çeşmində əzbəs yar hazırdır,
Şəbi-hicri gümanında güman sübhi-vüsal eylər.

* * *

Özü şirin, rəvişi şirindür,
Rəngidir sözü, əzbəs ki, ləbi rəngindür.

Sanma xamuşəm əgər vəsfi-ləbinən bica,
Udaram sözümi, əzbəs ki, sözüm şirindür.

Dəşti-məhşər kibidür, küyi-dili-zar kibi,
Qılıcı naleyi-üşşaq kibi xunundür.

Yarı görgəc dedim həml eyləmə iqrağə,
Rəngi, ləlü ləbi yaqutü dəhəni simindür.

Səhldür sözü əgər olmaya çün cananın,

Astini xeyü qaşı çeyü kəməndi xeydür.

Laqanəmü ləbi qanəmü dilidür qanəmü – dedim,
Neyləyim, dilbəri-xunrizimə bu ayindür.

* * *

Olma şükuftə gər bəni yandırsa dağlar,
Pərvanə gər nar isə, sönməz çırağlar.

* * *

Ey xoş ol aşiq ki, yarından onun irşadı var,
Yanmaz çün şəm'dən, pərvanənin ustadı var.

Görməlidür görməmək qafil əgər görsə bəni,
Şireyi-canımda ləzzət qalmamışdır, dadı var.

Rigi-səhra dağdakı daşlar şümarı yarımın,
Daməni-səhradə Məcnun, dağda Fərhadı var.

Şaddur aşiq ki, qəmgindür cəfayi-yardən,
Bənddədür öz qeydidən, əmma dili-azadı var.

Ömri-cavidan degil hər dəm vüsali-yar tək,
Xəlvəti-məşuqdur cənnət, behiştin adı var.

Yarə hər kim səcdə etdi dərd edər, qurban olum,
Hər namazın ayrı hər məzhəbidə bir övradı var.

Olma qafil, ol ləbi-kəmhərfdəndür şikvəmiz,
Sözləri cavidə ərz etmək əcaib dadı var.

Pay ta sər şə'm tək olmuş mühəyyayi-güdaz,
Dil olubdur vəsli-yarə qabili-istedadı var.

* * *

Təndəki rəgdən füzundur yarə könlüm xaməti,
Rişteyi-damından artıq toxusun, səyyaddur.

* * *

Bizə aqillərin tə'ni qəmi-eşqidə bicadur
Ki, Məcnun tək libasi-eynimiz damani-səhradur.

Bənə saldı nigəh, rəngim qaçıb candan təmə kəsdim,
Salasaldur, qaçaqaçdur, kəsakəsdür, tamaşadur.

Mübarək ağzı əzbəs ki, dardur, anda söz qalmaz,
Becadur gər beca düşnamına dersəm ki, bicadur.

Dilü can, taqətü səbrü qərarü dinü imanım,
Əgər kafir gözün taracə meyl etsə, mühəyyadur.

Xəti-püşti-ləbin gər can verürsə aşiqə, nola,
Xızır sərçeşmeyi-heyvan kənarında Məsihadur.

* * *

Asiman hər ay başı bir əkməgə möhtacdur,
Aftabi-xavəridən gərci sahibi-tacdur.

Bu nə yaydur saxlayın hər yanə kəfdir yayığı,
Görmişəm əsrükdü, zira ol daxi bir Həllacdur.

Hər gözə gögim canə səngi-səfrasın tək eylər zəbt,
Qarnı doymaz heyni-yeməkdən, gözü həm acdur.

Şə'm kim, təxti-zər  üzrə məclisi rövşən edər,
Onu gər yaxşı görsən, bir əsa, bir tacdür.

Bu dili-dana ki, tutmuşdur cahanı şöhrəti,
Bir asmış digi-fikrət, bir qızarmış sacdur.

Könlümü ləng iradə qoyma nigahın sirrini,
Kim bu məstü laübali sinədən ixracdur.

* * *

Hüsnünü yad seyr edəcək pürqürur olur,
Ol xudpərəstə ayinəsi kuhi-Tur olur.

Rəngi qaçar, təri tökülər, hüsni çaxnaşur,
Rüxsət əgər nəzarəyə versəm, fütur olur.

Dərdindən iztirab eləməz bu dili-həzin,
Dərdi budur ki, adət edəndə sur olur.

Fərzəndi xandə gərçi gözündür, vəli sənə,
Eynək təki çıxarmağı gahi zərur olur.

Peyvənddən nəcib ilə nacins olur nəcib,
Xəz kürdisi əgər yığa səndən, səmur olur.

O xubru ki, ruyi-həyadən tökər ərəq,
Hər qətrəsi behiştdə qılmanu hur olur.

Birlik ayağı gəlmiş arayə dodağını,
Gər dişləsəm üzündən zərur olur.

Yandırdıvü pişirdi bizi, pişmədi özi,
Vaiz çü oldu xaki xəmir tənur olur.

* * *

Olub gər vəsldən məşuq mane'i-göftgu eylər,
Bəsimdür bu ki, könlü könlümü səngi-siyu eylər.

Rəqib etdi çü vəslin təlx, olurdum hicrinə razı
Ki, canı üçün hər kimi daim arzu eylər.

Gözün görgəc nigahım qıldı tərki-mərdümi-çeşmim
Ki, ondan qaçar divanə, çün ahu nə xu eylər.

Özündən çəkməmişdir bən kibi divanə tək rəhmət,

Özündən guş etmişdür kim, onilən göftgu eylər.

Olub nasur müşki-zülfdən zəxmi-dilrişim,
Bəni rusvayi-aləm yarımın kuyində bu eylər.

Qübari-dil təyəmmüm toprağı etmiş nədən hazır,
Çü xunabi-dil ilə mərdümi-çeşmim vüzu eylər.

Olub məqsudu hasil o ərşi-izzətində,
Bəni ləbtəşnə qoymaz, könlümü cövr ilə su eylər.

Şikayət küfrdür məşüqdən, qəmxardür yarım,
Çü xab etdüm, bənə bu dövlət bidar eylər.

Vəhid, ol şux vəsli, şükrlillah, yüz verür, əmma
Bənim tək sən kibi bir yar hər kim arzu eylər.

* * *

Əgərçi birsə, əhli-kəmalə bin dimağ olur,
Əgər sən dil bilürsən, bir dili min eyləmağ olur.

* * *

Məzəm yoxdur, gədayi-kuyi-eşqəm, leyk camım var,
Əgər pərvanə tək biçaşt qalsam, leyk şamım var.

Əbəsdür bu cəhan, əmma əbəs meyxarəyə keçməz,
Hesabi-ömr olana bir səhər mahi-həramım var.

* * *

Xəyali-birlə könlüm şad olubdur,
Bənim məşuqim imdi yad olubdur.

Bulağdan yaş töküb fəryad edərlər,
Yolunda dağlar Fərhad olubdur.

Özümdən gizlərəm yuxum deyərdim,
Bənə səndən nələr bidad olubdur.

* * *

Əgər keçsən könüldən, şövqdən dağım közü oynar,
Gəlürsən, badeyi-könlüm özü çalıb, özü oynar.

* * *

Xəlq arasında olub rüsva düşər səhralərə,
Bilməmiş hər kim yerindən söz kibi bica keçər.

* * *

Səri-kuyində etdi şur sinəmdən nəqdi-can axır,
Bənə yaxşılıq oldu hər nə saydım yəman axır.

Degildi nöqteyi-mövhum tək açılması mümkün,
Sözün başı axmır qoydu ol şirin zəban axır.

Fələk aşiqləri, əlbəttə, binamü nişan qoymaz,
Bəni tayi-qaşı bipərvalərə etdi nişan axır.

Xətasız ovlara  seyd cəlbi-pişə düşməndir,
Bənim yaxşı sözüm düşmənlərə dəgdi yəman axır.

* * *

Hərçənd gədayıq səri-kuyində, nəmizdür,
Şirin dodağın həm meyinmiz, həm məzəmizdür.

* * *

Gahi sirişik sağıma, gahi sola düşər,
Bir tifli-şux kibi ki, ol yola düşər.

Tutmaz ayağı sərxoş olan tək səni görən,
Soldan düşər saqiyəvü sağdan düşər.

Əzbəs həvayi-vəsl aparmış qərarımı,
Gözdən dü qönçə tifli-sirişkim yola düşər.

* * *

Azar kibi yəman sağıtdın tək ziyan görər,
Bədbin olan kişi özü daim yəman görər.

Ol binəva ki, qan gözündən müttəsil axar,

Yanında dururkən o sərvi rəvan görər.

Şəkərdə nöql kibi zəbanın görər nihan,
Hər kim səni özünə dəmi həmzəban görər.

* * *

Yanmaq üçün şə'm tək pərvanənin ustadı var,
Ey xoş ol aşiq ki, yadından onun irşadı var.

Türfə nemətdir ki, dil yadi-ləbindən ab ola,
Dadmışam bu şəhdi-can, yaxşı əcaib dadı var.

Nəqşi-xatəm kibi boşdur zə'fdən aşiq yeri,
Yox özündən bir nişan, qalmış aradə, adı var.

Mehr üzündən həm bənə ol bədxu baxmaz dürüst,
Zəhri həm verməz deyincə bu onun dadı var.

Şəm'i-ruyin göstərər ta seyd edə pərvanəni,
Çıx kəmindən hər şikarın bir rəviş səyyadı var.

Şişə tək aşıq xəmuş olsa, şikayətsiz degil,
Zərrə-zərrə cismi-zarının cüda bir dadı var.

Dağə bənzər Kuhkən hərçənd zahirdə və leyk,
Dərdi-Şirindən batində bir Fərhadı var.

Vardır onun da Qarun kibi ağırlığı,

Qərq olur xuşkidə axır hər kimin pərizadı var.

Türfə halı var dili-zarın, nə qəmgindir, nə şad,
Adını bilməm deyəm, bilməm dəxi kim adı var.

Dilbərin həm sən kibi qəm seyr ola bilməz, Vəhid,
Bir dili-şad gər olsa, min dili-naşadı var.

* * *

Bərg odu ləfz eşitdigi ol qoca bənzəridür,
Həftad yeddi qülləsi əşkiyo fikridür.

Çün portakali-kal dəyməmişdür, yetişməmiş,
Sorsan bizim meyü məzəmizdən nə tərəbdür.

Qarun edüb bənim dilimi kimiyayi-eşq,
Yarın xəyali qırmızısı sinə girəndür.

* * *

Təsəvvür qılma bədbinin tərəbdən bəhrəsi vardur,
Cəhani-bədbini gözünə didə süzən kəsi vardur.

Nigari-sərvi mehrin cövründən ahü fəğan etməm,
Əgər bilsəm ki, bu yetirmənin atışması vardur.

* * *

Yolsuzluq edər isə səninlə rəfiqlər,
Qoy ta bəlaya uğrayalar bu fəriqlər.

Vardır ağacı, sahibi-ərkan tutar övrəng,
Hər kim çıxarsa yoldan, onu yol təriqlər.

Ol qönçələb təbəssümü etdi bəni cəvan,
Su verdi susuz cigərə bu əqiqlər.

* * *

Yanında surət ki, çəkərlər mütəhərrik,
Yoxdur bədənim içrə rəvan, gər hərəkət var.

* * *

Gözüm işığı, gözüm gözlərinə heyrandır,
Qaçar yerində durarkən bu türfə, heyrandır.

* * *

Hər kim ayağın torpağın gözünə sürtər,
Gər xaki-kəfi-payi olursan, gözün örtər.

Yar gəldivü gülşəndə dəxi güllər açıldı,
Bu qanlı əli gül budağı yanıma sürtər.

* * *

Əldən başa çü gəldi əyaq, əqəbi dur edər,
Yoxdur əgərçi duzu, dili türfə şur edər.
Bülbül kibi ki, məst olur gül əyaqdan,
Sağər düzünün laləsini bişüur edər.

* * *

Rəhm et bənə, heyranın olum, getmə nəzərdən,
Göz işığısan, göz işığı gözdə gərəkdür.

* * *

İnzivası nur kibi məşhur edərsə zahidi,
Bir quru ağacı da yalquzluğu məşhur edər.

* * *

Ta könül bağında yarın məbada gül dərim,
Dövri-kəməndi-xədəng bu bağın dövrini … edər

* * *

Duymaq sənin ləbü dəhənindən nə ehtimal,
Qurbanınam, qarın doyuran aşı kor tanur.

* * *

Dodağın, başına qurban olum, qəmdən yorulmuşdur,
Yenə nərgis gözün eşq odudan, cana, sorulmuşdur.

Bəni məşuq çəkən boş çağla görsə çün üryan,
Dügünlər tikmə tək köksümdə eşqindən düzülmüşdür.

* * *

Gər imşəb bisəmər zahidlər üçün çox deyibdirlər,
Buları onlara yer ağacı tək bağlayıbdırlar.

* * *

Özgəsi eybinə dil öz eybindən  məşğuldur,
Adəm oğlu arasında bu əda məmuldur.

Şöleyi-şəm ilə aru etsə gər ev dəvisi,
Yardan könlünü aşiq istəsən, məqdurdur.

* * *

Xəmidə quru bədənimdən leşin murdar kibidür,
Və leykən verməyəm əldən onu, gülşən gülüdür.

* * *

Səlayi-vəsl əgər dersə yar getdim günü,
Keçər beşitdən,əlbəttə, hər ki, adəmdür.

* * *

Xani-Xızırın bir sözü ömründə gögərməz,

Guya qurumuş bir ağacın min budağıdur.

* * *

Mərdümək rəşki edər qan bağrımı, gər göz açar,
Yardən aşıq olan özünü yeg daim qaçar.

* * *

Bəni etmiş fəraqın kafir, imanım bəzmin nuşdur,
Edübdür qalibi-bican bəni, canım yerin nuşdur.

Cəmalın gözlərindən ta ki, qayib oldu binalıq,
Gözündə qalmadı, yəni ki, sultanım, bəzmin nuşdur.

* * *

Yarıma nisbət əgərçi səyi-atəşbardur,
Pərtövi-xurşid qazi döşəyi tək xardur.

* * *

Ahim ələm  olanda alışdı dimağlar,
Pərvanəni görəndə söndü çırağlar.

* * *

Sən qocaldın, gərçi bənə dərdin halıdur,
Bu ağarmış muy günün mürmıraq saqqalıdur.

* * *

Onlar ki, pəri şəklinə dilxah çəkərlər,
Məşuqi-cəmalini görüb ah çəkərlər.

* * *

Degilsən gərçi tari, leyk ağrısız göftguyin var,
Lətafətdən degilsən çeşm, əmma rəngü buyin var.

* * *

Lütfdən qalır cəmalında nişan nəzzarədən,
Səfheyi-ruyin xəti bəd nəzərdən yazılur.

İstərəm bən geriləyüm əğyardən cövrün, vəli
Səfheyi-rüxsarə xunabi-cigərdən yazılur.

* * *

Vallah, kəduyi-mey mənim başımdur,
Mütrib tənə çörəgim, aşımdur.

Tənburü kəmança yarü yoldaşımdur,
Ney daxi nəfəs oxşama qardaşımdur.

* * *

Cəhan şuğlini tərk etmək xəyal etmə, çətin işdür,
Bu həm bu gördügün işlər kibi aşuftə bir işdür.

* * *

Degil fərzənd ki, mümkün ondan dağılar xakə,
Əgərçi var giran, əmma genə bağırsa başımdır.

* * *

Sənsən ki, can gedəndə qədəm basmadın gözə,
Əzdad bir yerin yeri boşluğuna gəlür.

* * *

Abi-heyvandan düşübdür, çü təkrar yox yarımız,
Xızr ömründən füzun gəldi şəbi-bimarımız.

Şurişi dəryayi-cünun, gərdi-külufti-Bisütun,
Kəbeyi-kuyində oldur karımız bu yarımız.

Gilveyi-dəşti-ədəm kəsməz nəzərdən ləhzə,
Ta nəfəs pəstü bülənd etmiş rəhi-həmvarımız.

* * *

Çarəmizdir çün təmənnayi-dili-avarəmiz,
Dil nihali-dərd oldun, çün tapılmaz çarəmiz.

Səbrü taqətdən dili-zarım boşaldı çün hübab,

Şişə olmuş kuzeyi-eşqində səngi-xarəmiz.

Tərcüman gəldi arayə, eylədi fariğ bəni,
Bizi xamış eylədi çün ağızdan çıxdı yarəmiz.

Qarə zülfi həlqələrdən yer-yerə bir cahdür,
Bilmənəm halı  niyə keçdi dili-avarəmiz.

Tifldür, oynar gəhi rəd, gəh qəbul etməz onu,
Rişteyi-gül yarə gəlmiş bu dili-sədparəmiz.

Bən xəmuşəm gərçi əmma  şami-hicran ta səhər,
Yarını qoymaz yata, əzbəs sızıldar yarəmiz.

Dəmbədəm feyzi yetər bu xaksarə gün kibi,
Gərçi səndən bir nəfəs hali degildür arəmiz.

Rişteyi-ahi çəkər ta daməni-məhşər Vəhid,
Bənd salmış əlinə alsan bu dili-məkkarəmiz.

* * *

İstərəm Həqdən ki, bir dəm olmayım əğyarsız.
Çün olan əğyarsız qalmaq gərəkdür yarsız.

Dərd bidərman olur, dərdi-təbiət biməriz,
Ey təbibi aşiqan, qalmıya bimarsız.

Yenə tərk etdün fəğanı, oldu çün viran könül,

Qapı bağlatmaq nelər bu xanə divarsız.

Başqa hər sərkar məşuqun həvasından gərək,
Gər hübabına bina mümkün degil memarsız.

Yar mümkündür dili-zarın qüsuridən keçə,
Gər keçərsə karvandan rahzən azarsız.

Der idim xeyməyə şərmi-cəmalından hilal,
Genə  çıxmış, qoymuş əgri nur kibi bu arsız.

Qoyma əldən yar zülfüni, könül, etdin əşədd,
Görmüşəm, bel bağlamaz kafər olan zünnarsız.

* * *

Şişəmiz fikrinə düşmüş ta ki, səngi-xarəmiz,
Nalədən farığ degil bir dəm dili-sədparəmiz.

Kaseyi-tənbur tək ləbrizi-əfğan olmuşuz,
Bilmərüz, cana ki, nalandır qəmindən harəmiz.

Etdi bizi, etdi rüsva aqibət Məcnun kibi,
Ağrı təriqi-düşmən, can kibi çəp parəmiz.

Şəm'əm, əmma o dili-suzanı əldən vermişəm,
Bilmənəm şimdi nədir şəhbayi-hicran çarəmiz.

Aməd tale dedi andan çü eşitdim xəbər,
Çini-zülfi-yarə getmiş bu dili-avarəmiz.

Surəti-divar edər Fərhadı təsviri kibi,
Açar isə ağzını gər qanlı sözi-biparəmiz.

Naləmizdən kuh tək ol bağrı daş fəryad edər,
Yaxşı düşmüş şişəmiz fikrinə səngi-xarəmiz.

Şükrilillah, rövşən oldu şə'm tək çeşmü dilim,
Ta alışdı gül yüzündən rişteyi-nəzzarəmiz.

* * *

Könül minasını qəm bir nəfəs olmaz ki, sındırmaz,
Məhəbbət binəva aşiqləri hərçənd döndərməz.

Sözün can acısı tək acıdır, sən gərçi şirinsən,
Bənə bu sözləri şirin ləbin təb'i bulandırmaz.

Könül çəkmiş mükərrər cövrini, mirabını tutmuş,
Bizə ol bivəfa baş sərgiran olduqda endirməz.

Sual etdim muradım, ləblərindən olmadı hasil,
Gədayi-dərgəhin sahibkərəm hərgiz dindirməz.

* * *

Degil vəsli müyəssər dilbərin, ta nalə dam olmaz,
Bu ahunu gəzər, ta rəm yeməz, səyyadə ram olmaz.

Edər peyvənd əgər dil şişəsi qəmdən sinə əfğan,
Arayə ot ayağı gəlməyincə, iltiyam olmaz.

Kəmali-nəfs əgər mətləb düşübdür, eşqdən keçmə
Ki, ta zərfi-gülün baş-gözünə çəkməz, təmam olmaz.

Nikuxah olma xəlqi-aləmə, çün çoxları gördün
Ki, təxir istəməz mərdudi-mərdüm, çün səlam olmaz.

Kəmali olmayan bağlar üzünə üz kibi evin
Ki, ləli-əngüştəri fuladdən cuyayi-nam olmaz.

Bu tənha gərduni-biganə gəzmə, qalma biməni,
Yapışmaz bir-birə, ta hərfdən hərgiz kəlam olmaz.

Bənə əzbəs ki, vəsli-ahəngi canım biqərar etmiş,
Vətəni-sövti-məni kibi hərgiz bir məqam olmaz.

* * *

Canan didəmə ovçular ov aldıra bilməz,
Laçın ovunu qaynağından saldıra bilməz.

Dedin yenə yoxdur səhəri şami-fərağın,
Hər kim ki, səni gördü, dəxi gün görə bilməz.

Ta oxşadılıbdır gözünə nərgisi-şəhla,
Şərməndəligində başını qaldıra bilməz.

Həmçeşmlərə qəm neləyübdür demək olmaz,

Nərgis yorqanına əlac eyləmək olmaz.

* * *

Canan ki, doğulmuş aftab ilə əgər,
Ləli yanında çe bal, yüzdə çe qəmər.

* * *

Yalquz bizə ehtimalı yoxdur ki, gələ,
Çün könüldə xəyalı gəlməz lələsiz.

* * *

Kuhkən sə'yi əgərçi yarıma kar eyləməz,
Surətə can verdigini leyk inkar eyləməz.

* * *

Yaman görməz gözü, əlbəttə, hər kim zahidi görməz,
Yaman hərgiz eşitməz kim ki, vaizdən xəbər sormaz.

* * *

Degil meyxanə məktəb, rindi-meykeş, kudəki-məktəb,
Deyər olsun şəbi-adinədir, mütləq qulaq verməz.

* * *

Doludur bəzmin əzbəs bülhəvəsdən,

Səni tapmağa göz gəzdirmaq olmaz.

* * *

Əbr qalxardı gözümdən görməmiş nəmnəm hənuz,
Etməmiş qəmdən dimağın bir güli-adəm hənuz.

Məniyi-biganə tarac eyləmişdi əqlimi,
Bir-birilən ləfzü məni olmamış məhrəm hənuz.

Vermişdim yarıma nəqdi-dilü imanımı,
Girməmiş meydanə rəxşi-himmət canım hənuz.

Sayılırdı bu dili-kəmzərf gərduni-ziyad,
Olmamış mizani-tərazuyi ziyadü kəm hənuz.

Şöleyi-ahım gəzərdi çərxdə yalın qılıc,
Geyməmişkən xaki-zər xilqəti-adəm hənuz.

Vəhşəti-eşq etmiş idi sircan bəni,
Etməmiş torpağa ğəzal çeşmi-xuban rəm hənuz.

* * *

Qan oldu çü aşiq dili göz fikrinə düşməz,
Hər kim görər ol ağzını, söz fikrinə düşməz.

Sərbəsər əgər payi-dilim seyri-rüxündə,
Ta çahi-zənəx var isə öz fikrinə düşməz.

Atəşkədəni xamuş edər əşki-kəbabım,
Ol atəşi-suzan yenə köz fikrinə düşməz.

* * *

Cəhan ahü fəğan atəşindən xəzan olmuş,
Ayağım çiçəgindən yol ağacı ərğəvan olmuş.

Rəvan oldu səvari-əşk hər dil parəsi yerə,
Nəzərdə şimdi ol bir rahrov bir karvan olmuş.

Degil şimdi şərər eşqim ki, qalsın sinədə pünhan,
Ona hər dəm nəfəs damən verüb sahibzəman olmuş.

Şəhid olmuş təmənnalər ki, olmuş mətləbim hasil,
Olub sinəmdə bin qan, ta könül hər qətrə qan olmuş.

Degil bir dil ağızlı ləblərin şəhdi mədəd qılmış
Ki, xurma üstüxanı tək dilim sahibdəhan olmuş.

Ola bilməz gözündən kiprigim tək ləhzeyi-qaib,
Əgərçi ol miyani-muy nigahimdən nihan olmuş.

Edüb ovraqi-tifli-mərdümək könlüm gülüstanın,
Güman etməz ki, asan əşkimin dərsi rəvan olmuş.

Sınıbdır ta könül əflakinə dəstü giryandır,
Yenə bu şişəni ta nalə dərsi-pəhləvan olmuş.

* * *

Halım görübən olmadı kutəh şəbi-hicran,
Rəhm eyləmədi heç bənə bu saçı kəsilmiş.

* * *

Umma gərdundən əlaci-zə'fi-tale, ey məriz,
Çünki bu gög kağız içrə bu dəvayi-xas imiş.

* * *

Dün Vəhidi gördüm əlhəq, qabili-bidad imiş,
Daş canlı, şişə bağırlı əcaib zad imiş.

Bir nəfəs xali degildi sinəsi fəryaddən,
Bisütuni gördüm öz yanında bir Fərhad imiş.

Sinədən baxdıqca azdırdı, apardı könlümü,
Yarım kudək çağladım, əmma  əcəb ustad imiş.

Görmüşəm yarın ləbü rüxsarü qədü qamətin,
Həm gülü həm laləvü həm sərvü həm şümşad imiş.

* * *

Məşuq ki, aftab yoldaşı imiş,
Pişanisi, hüsnü, həvəsi kaşı imiş.

Ayinə ki, aşina gəlür didələrə
Məşuqnəfəs, oxşama qardaşı imiş.

* * *

Zahid, incitmə bəni, bən sərxoşü sən bidəmağ,
Ya əlimdən çək ayağı, ya ki bizdən çək ayağ.

* * *

Nihali-gül kibi olur xəmidə çeşmü çırağ,
Baş üstədir yeri, hər kim elər başını ayağ.

* * *

Vəsliğə hicran kibi olmaz bəni-zarə hərif,
Rişteyi-tamlıq içrə vəsldən boldum zəif.

Camə içrə görməsi olur meyə çün hübab,
Olsa çün üryan, görünməsin bəs ki, cismdir lətif.

Atəşi olur libasım cameyi-fanus tək,
Çün xəyalı gəlməyir könlümğə təşrifi-şərif.

Ta güli-yar irçə baqi, şaxi-güldür xarəsi,
Söhbəti-canan əcəb olması bəni etsə zərif.

Müntəzəm əqddir gözəllər söhbəti,
Bən kibi yar isər gər aralarında bir nəhif.

Hasili yardur bilsən ki, rəngi-gül bimar tək,
Meyvə bir baş gər çiçək açsa, həngami-xərif.

Necə kim gərdənimə xəbər gətir daim, Vəhid,
Bilə irmas kəbətulladır … təklif

* * *

Özünə sarı kəsər, bir nəstə bir kimdən kəsər,
Çünki zahid batini kəskin düşübdür daş tək.

* * *

Yox əzizi bir dəxi dinari-səngi-bal tək,
Nəqdi çıxmaz kisədən hərfi-zəbani-lal tək.

Şərmi-fe'li-ziştdən hər ləhzə bir müşkil olur,
Özünə hər kim görərsə qür'eyi-rəmmal tək.

Hüsni-şuxini görəndən sonra bir sal xubru,
Əl əsasın özünə mərkəb edər ətfal tək.

Ol düri-dəndan kibi gülməz sədəfdən, ey səhab,
Sənə bu arada tər tökmək qalur cəmal tək.

Ol şəkərləb ayə ta etdim işarəti-dövran,
Ol zəmandan barmaq əmməkdir işim ətfal tək.

* * *

Həlaki mürği-dil xəlq əgər irərsə xəyalın,
Düşər ağızlara qərbal kibi daneyi-xalın.

* * *

Mürği-dil seydi əgər, ey şux, mənzurin ola,
Daneyi-xalın düşər ağızlara qərbal tək.

* * *

Mayeyi-can mövcibi-iman olur hər kim ki var,
Tozquran yel kibi, dilsuz gərdin tək.

* * *

Yüzündən oldu şəm'i-bəzmi-rövşən, yarə bənzərsən
Əcaibdür deyərsən yarıma qəmxarə bənzərsən.

Necə nisbət edim xurşidə ol rüxsari-dirəxşanı,
Səni, ey ay üzlü, ay tək bir güli-bixarə bənzərsən.

İşarətdən damar qan, bəs ki, nazifdir güli-ruyin,
Şərabi-hüsndən bir sağəri-sərşarə bənzərsən.

Yoxam bən, leyk sən, ey çeşm, canan … içərsən,
Qəmü dərdini dersəm, canü dili-bimarə bənzərsən.

* * *

Şərabın keyfi əksüklük edər şuri-dimağımdan,
Bənə yegrəg degil xüldi-bərin künci-qırağından.

Behəmdüllah ki, yetməz dövlətimdən kimsəyə nöqsan,
Pəri pərvanə yanmaz şöleyi-şəm'i-çırağımdan.

Çıxarır baş yüzündən çün ayağım, əlbəttə batdı,
Çıxar böylə əgər gahi tikan çıxsa ayağımdan.

* * *

Qan oldu ta könül, sənə yetdi şərab tək,
Əzbəs ki, gəzdi qan yerə batdı kəbab tək.

Pürhünərdür kim ola xəlqə əhli-kəmal,
İşrət əyyamı çəkər zəhmət dəf-qəval tək.

* * *

Gözüm, güzgüyə bax, heç kimsəni sayma özündən tək,
Gözüm gər dərdi gün çox görmədi bir başımdan tək.

Mənim tək nəqşi-payım gərçi xahi-rahə yeksandır,
Təriqi-bəndəlikdə düşməmiş torpağından tək.

Süleymana qul olmaq Adəm oğluna şər deyilmiş,
Bu dövlətliyə qulluqdur … oğlan getdiyin tək.

Zəbanın, ya dəhanın, ya ləbin, cana, cəvanımdır,

Ver olsun bənə, söylə nədir, ya rəb … tək.

* * *

İstərəm xaric fəğan bu binəvadan çıxmasın,
Girsəm peyman kibi bən səs aradan çıxmasın.

Etmə bülbül tək fəğan bağça kibi dilbərin,
Bir də könlü pərişan bu aradən çıxmasın.

Çıxmasın könlüm başdan istərəm bir dua,
Bu səbəbdən bir xəta dəsti-qəzadən çıxmasın.

Yarımı qoynumda şami-vəsl əgər qismət ola,
Öylə həyyan istərəm ki, söz aradən çıxmasın.

* * *

Abi-heyvanda nişan yarın səfasından gərək,
Qönçeyi-nəşküftədə buyi qəbasından gərək.

Xaneyi-çeşmini dair istərəm bəsi çün hübab,
Başda bir sərkar məşuqun həvasından gərək,

Badəni saf etməyə hər kim gedər meyxanəyə,
Seydə bir parə məlayik ridasından gərək.

Məsiyət səfrasını sındırmaq üçün rahdə,
Xofdən birisivü şirin ricasından gərək.

Vədə yetmiş hər kimə seyri-behişti-pirəhən,
Əldə ondan birisində bəndi-qəbasından gərək.

Kim ki istər düşməni dəf edə, yəni qəmin,
Yarlıq bu işdə tövfiq  Xudasından gərək.

* * *

Sənhaf apardı huşimi başımdan şərab tək,
Etdi vərəq-vərəq ürəgimi kəbab tək.

* * *

Dil tökməsini nigahın çözmiyəsən,
Bu yola gedərsən, həzər et, üzmiyəsən.

Aru kibi dünya dolanır əndək zinhar,
Qəm quşlarının yatağını pozmiyəsən.

* * *

Olmuş çiçək bəzmin bənə dami-şikar tək,
Açıl nuri-çiçəgi nigarım bahar tək.

Daman çü çəkdim, ondan ilişdi bənə rəqib,
Sındı ayağın altda bixarə xar tək.

Gəldi bahar onun cilovunda çökürüldüm,
Gördüm güli-sadəni Sami-səvar tək.

Ya Rəb, nə etmişəm ki, tükənməz şəbi-fəraq,
Biintəha bənə görünür intizar tək.

Qan yaş içində süxteyi-pərkalə çəkər,
Damanını bənə eləmiş laləzar tək.

Canan şərab içüb, qararub çün səvar olub,
Üşşaq nəqdi-canı saçarlar nisar tək.

Çün axdı, eylədi səfəri-çərx ixtiyar,
Hər qətreyi-sirişk gözümdən şərar tək.

Ol süflə kim uçulmuşü həlqə edər dimağ,
Başı böyükdür, əsli kiçik küknar tək.

Pərvanə ism dərsini xəlqə edər əyan,
Şəm'i-məzar olub ona lövhi-məzar tək.

Zinhar, yum gözün, yoluxursa əgər sənə,
Gər asimanə süflə çıxarsa qübar tək.

Olmuş, Vəhid, bəs ki, bənə dəşt dilnişin,
Vəhşivü dəştdür bənə yarü diyar tək.

* * *

Taparsan gər Fəlatün tək xüm, irfanə rənginsən,
Əgər dil ögünürsən öz dilin tək bir rənginsən.

* * *

Surət tapanda eşq, məlamət yəman degil,
Nəqqaşə dağı çəkməgi olsa giran degil.

Bən bağrımı əsər ki, mənim gözlərim sevim,
Qan içməyi məriz olana gər ziyan degil.

Ya Rəb ki, dərd ləzzəti könlü basmasın,
Hər kim səni verirsə bənə mehriban degil.

Güzgünü görsə vəhşəti çağlar ki, damdır,
Yəni, düşə xəyalimə canan, güman degil.

Dedim ki, gör zəifligim, rəhm qıl bənə,
Dedi ki, kuhi-dərd çəkən natəvan degil.

Rüsva edər fəğan bəni, gər eşqi gizləsən,
Atəş əgər nihan ola, dövri nihan degil.

Çün aşiyanə tərhinə yapmış evini gül,
Biçarə əndəlibə neçün aşiyan degil.

Naseh edərək yamağı bənə sərzəniş edər,
Qəm nəs'əsin tapa bilməz, meydür bu, can degül.

Basdı qədəm gözüm evinə çün dil bu gün,
Könlümdə yadi-yar məgər mehman degil?

Oldu gədayi-meykədə piranəsər Vəhid,
Bir cam ilə əlimi tutarsa, yəman degil.

Dil ahu nalə gər edə sahibi-əmrü dil,
Quşlar bıçağı tək bu qılıclar kəsər degil.

Ey birəhm, bülbül qaili-təhsin degil,
Bu əda … qədər naz, ya təmkin degil.

Xatirin riş etmə xari-cövr ilən, ey şaxi-gül,
Dirəngi gəlmiş dərə, bu binəva gülçin degil.

* * *

Dərd üzündən ney kibi hərçənd fəryad eylərəm,
Naleyi-ney kibi canan könlünü şad eylərəm.

Bən giriftarəm, vəli naləm cəhan miftahıdır,
Bülbülü ahəstə gül qeydidən azad eylərəm.

Gəlmişəm daminə, çağlarsan düşübdür mahtab,
Tari-şəblərdə kim ol, ey üzünü yad eylərəm.

Bir nigah ol şərmlü gözdən nəsibim olmadı,
Etmə mən'im, gər səri-kuyində fəryad eylərəm.

Güldə qalmış naləm, əzbəs tökmüşəm qanlı sirişk,
Bən səni hədidə, ey bimehr, imdad eylərəm.

Yol azıb düşsə yola Məcnuni-şeyda bihuş,
Bən anı gümgəştəlik dəştinə irşad eylərəm.

Ta xəta olmaz oxun bəndən bənə rəhm eyləməz,
Nalə qəmdən etməsəm, cana, səni şad eylərəm.

Mətləbim rüxsarü xəttin, qaməti-məşuqdur,
Bən əgər yadi-gülü reyhanü şümşad eylərəm.

Dudi-ahimdən kəvakib göz yolları, Vəhid,
Şami-hicran naleyi-zarı çü bünyad eylərəm.

* * *

Dedim gər gözləri su qılsa könlüm seyr olur bəxtim,
Bu ahu otlayan yerlər gögərməz, imtəhan qıldım.

* * *

Baş əgib qulluğuna hərgəh ki, baş endərmişəm,
Şükr dedikcə könülümüzü dillə dindirmişəm.

İtləridən dövlət bu qanunə töəməm,
Məni bicadan sayma kim, ərzaq, sümük sındırmışam.

* * *

Eşqi inkar edə, bilməm neyləyim,
Dərdi izhar edə, bilməm neyləyim.

Nalə etmək ol qədr müşkil degil,
Aləmi tar edə, bilməm neyləyim.

Yar bağrı xoş degül qan eyləmək,
Naləmi zar edə, bilməm neyləyim.

Seyli-əşkim dağı həmvar eylədi,
Yarı həmvar edə, bilməm neyləyim.

Ola bilməz yardan hərgiz cüda,
Tərki-əğyar edə, bilməm neyləyim.

Qorxuram bir gül aça daği-cünun,
Bəxti bidar edə, bilməm neyləyim.

Bir baxışda yara verdim canımı,
İşi düşvar edə, bilməm neyləyim.

Bir nəfəsi düşməz əldən köz kibi,
Yarı bidar edə, bilməm neyləyim.

* * *

Gər baxarsa yar, çün müşkil degil can çəkdügim,
Nola, ya Rəb, görsə bu düşvarı asan çəkdügim.

İstərəm kim, vədeyi-vəslə ləbindən sur çəkəm,
İstəyirsən mətləbin bindir, budur can çəkdügim.

Etmişəm lövhi-dilə təsviri-zülfi-yarımı,
Bu səbəbdəndür müdam ahi-pərişan çəkdügim.

Ləxti-dildən qeyri-nəm var yar çün mehman ola,
Bir gədayəm, yar əgər gəlsə, budur can çəkdügim.

Bən həmin muri-zəifəm ki, Süleyman ağzıdan,
Əcz ilə söz çəkmişəm, bica degil can çəkdügim.

* * *

Yox dəhanı, söz deyə, andan əbəs mən küsmüşəm,
Yar bitəqsirdür, bən böylə heçdən küsmüşəm.

* * *

Kədu başın kəsüb, sağər edüb, cismü candan keçdim,
Şərabı qoymanam əldən, kədu, ya şişəyə, and içdim.

* * *

İstərəm bin busə saqidən, çü bir cam istərəm,
Üstəlik həm istərəm, çün yardən kam istərəm.

Vəsli-digərin vəsldən aşiq deyərlər istəməz,
Mən çü öldüm eşqdən, rüsvavü-bədnam  istərəm.

İstəşübsən kim nə istər sineyi-sədçakdən,

Gər qazar olsam nigin tək sinəmi nam istərəm.

Məstü rüsva bir zəman söz eyləməz, dil bilməzəm,
Bülbüləm, dam istərəm, gər lütfi-əndam istərəm.

Dinü imandan gərək keçmək təriqi-eşqdə,
Lütf azdır yardən, lütfindən aram istərəm.

* * *

Gəlmişəm, şirin ləbindən şireyi-can istərəm,
Görmüşəm, zülmati-zülfün abi heyvan istərəm.

Səndə vardır, ey pəritələt, Süleyman mərhəmi,
Yaralı bağrım görüb gər etsən, ehsan istərəm.

Halımı gör, gözlərim nuru, demə halın nədür,
Ləblərindən qüvvəti-ruhü quti-can istərəm.

Duzlu sözlərdən bəni süzəndə etmiş ləblərin,
Pay bu dövrdən etdi çün bağrımı büryan istərəm.

Bilmənəm səhba nədür, mütrib nədür, gülşən nədür,
Bən pərişan xatirəm, zülfi-pərişan istərəm.

Vəsldə məhrum urmaq hicrindür acıraq,
Ya dirayət canadır, ölsəm ki, hicran istərəm.

Abi-ruyin itlərin yanında, ey bimehrdar,

Etməsin nazın bəni toprağə yeksan, istərəm.

Bağə gəlməkdən degül gül, mətləbim sənsən, gülüm,
Özümə həmnalə bir mürği-xoşəlhan istərəm.

Etməsən ən'am, etmə, al busə yüz əvəz,
Buseyi-şirin ləblərindən dəsti-gərdan istərəm.

Ola bilməz alım şirin ləbindən həqqimi,
Bən əgər muri-zəifəm, gər Süleyman istərəm.

Bir ümid ilə sənin qapına, cana, gəlmişəm,
Var derlər dərdimə ləlində dərman istərəm.

* * *

Kənarım gül budağı kibi bir ləxti-cigər gördüm,
Deyə bilməm koram, görgəc səni gözdən səmər gördüm.

Gər öldürsən bəni məhşər günü pamal olur qanım
Ki, mən hərgiz səni gördüm, özümdən bixəbər gördüm.

Əritdi, əglədi, yandırdı canım yari-bipərva,
Bu gözüm işığından şəm' tək daim zərər gördüm.

Eşitdi naləmi, birəhmraq oldu bənə yarım,
Deyə bilməm əsərsizdür, fərağımdan əsər gördüm.

Qaimi-qulluq sənin tək kimsə yoxdur dilrübalıqda

Ki, baxdım hər yana, qarşımda timsalın durar gördüm.

* * *

Aparmaz dəstü dil özünü gördükcə qurbanım,
Şirişkim şəm'i-məclis kibi xak etmiş giribanım.

* * *

Ləblərini yarəsiz əldən buraxsam, kafərəm,
Yarimə gər bir daraşlıq, bir də qafil var isəm.

* * *

Yarimə can istərəm, əğyardan pünhan derəm,
Surətini  sən çək, ey nəqqaş, ta bən can derəm.

Dərdünə söylə ki, can verir tənimdən xəsmin,
Sevgidim, gər istər isən canımı asan verəm.

* * *

Qayta qatla, nə qəm, ta badəyə əl qatmanam,
Bu suya gər batmanam, yüz batmanam, min batmanam.

Bən nişanəm qeybdir, cana, nişandan ehtiraz,
At, mənəm, qurbanınam, at oxunu, bən itmənəm.

Canımı gər dərdünə salmaq münasibdür sənə,
Sat, mənəm, mən, gər bəni ta bilməz isən, satmanam.

Seyd edən çağlarda bu dəmin qeyri çakəriyəm,
Çat, mənəm, bir özgə mətləb gər der isəm, çatmanam.

Gər desən kim, dur qatılmış qocaya fərmanıma,
Qat, mənəm, qat bu sözə, əlbəttə mən söz qatmanam.

Güzgüyəm, güzgü və leykən razı ifşa etmənəm,
Üzünü görsətmənəm, mən özgəyə görsətmənəm.

Xoş gəlür əldaq anılmadın, vədeyi-vəsl mənimsən,
Mən səni aldatmanam, mən həm səni aldatmanam.

Görsən bietibarəm, pasibanəm hüsnünə,
Yat, mənəm, cana, mənəm, yat yanıma sən, yatmanam.

* * *

Nola qəmdən alışam, ərzi-məhəbbət edim,
Xari-qəmi-eşq, avazeyi-fərağət edim.

Güni seyr istərdi rövşən edə çeşmimi günüm,
Boşadım canımı, ta əqdi-məhəbbət edim.

* * *

Mən bir bəlalı dilbəri-ovbaşə aşiqəm,
Pərvanə kibi fitnəvü pərxaşə aşiqəm.

Pərvanəyə dedim kimə verdin, dedim, dedi:
Sənin bir ləbin-qılıncı-qızılbaşə aşiqəm.

* * *

Aşıq oldum, hər nə etsən, bən üzündən görürəm,
Gər bəni ağlatsa, bən öz gözündən görürəm,

Yar almış canımı, bən taleimdən incirəm,
Yandurubdur gün bəni, gözündən görürəm.

* * *

Uymadı ta göz xəyaı kəsmədi könlüm ondan,
Nola bu oğru saqına, əgər qan ağladım.

* * *

Bilmənəm munca yenə fərmanına zənciriyəm,
Söylə tari-zülfi-canan, min piçidənin biriyəm.

Bən kibi ol həm gərəkdür aya fərmanımı,
Necə kim, canan cəvanımdır, bən onun piriyəm.

Heç tərəfdən ol cəfacu könlünə yoxdur yolum,
Öylə çağlarsan ki, bən öz naləmin təsiriyəm.

Bən çü mumi-şəm'əmü məşuq nuri-şəm'dür,

Bən həqiqətdə onun sərmayeyi-təmiriyəm.

Olma dərhəm, gər səri-kuyində fəryad eylərəm,
Bu xəyalilə ki, bən həm itləründən biriyəm.

* * *

Yüz cəfa gər eylədin, yüz cövrdən döndərmədim,
Gülmədi könlüm, gögə fəryadımı göndərmədim.

Ögünürlər dil bilənlər, gərçi dil məndən, vəli
Dilləri ögrəndim, əldaq dilini ögrənmədim.

Düşmənin can acısı tək verdi bir şirin səmər,
Bağī-dildə nalə nəxlini əbəs göndərmədim.

* * *

Bir nəfəs qafil degil məşuq halimdən ki, bən
Natəvanlıqdan degil mümkün ki, yadından gedim.

* * *

Bu qapudə dövlətü əhbabilə tövəmçinəm,
Bəni bimardan sayma kim, ərzaq sümük sındırmışam.

* * *

Rəgimdə qətreyi-xundur peyvənd mayedən,

Açılmaqdan açılmaz su kibi bu üqdə baridən.

* * *

Ta can alışdı, səndən qarqış qapı olubdur
Zira səni görünməz yansun deyər çırağın.

* * *

Bibəhrə ta ki, qalmaya ondan iraq olan,
Oldu iki ayağı küp ayağına sınan.

* * *

Çün alırdı bac yarım bu dili-divanədən,
Bağlamışdı kiseyi-həll, sındı zülfi-şanədən.

Ərseyi-meydanda keçmək bir qəddin asan degil,
Bən ayağdan düşmüşəm, ya keçmişəm peymanədən.

Qoşar birisi bərq ilən sibqət tuta bu üftadəlik,
Şəm başdan keçər, keçməz vəli pərvanədən.

Nazdən hər eldə belindən çıxarmaz bir əlin,
Gül kibi bir qatlə hər bir ildə çıxmaz xanədən.

* * *

Apardın mey, hər ki mey tək, ey gül məndən gəldin,

Qəmim getdi üzümdən, getməməm gəldi, xoş gəldin.

Pəri tək badə həbsi-şişədən bir Süleymanə,
Behəmdüllah, genə, ey Yusifi-gülpirəhən gəldin.

* * *

Üzinə çıxdı xətin, tazə müsəlman sənsən,
Haciyi-Kəbeyi-dil, rəhzəni-iman sənsən.

Ona bənzər ki, bəşər qulu sayır qaranı,
Verər olsa sənə hər kimsə ki insan sənsən.

Abi-heyvanı edər toprağa yeksan, cana,
Sənə hər kimsə deyər, sevdicigim, can sənsən.

Xublar yığnaq edər şəm'i-şəbəfruzi-rüxin,
Çağlaram, ey büti-gülçöhrə, pərixan sənsən.

Başına nola, əgər cəm ola pərvanə kibi,
Canü dil quşları məbədə Süleyman sənsən.

Görmədim kim ola səyyad qaça seydindən,
Aşiqindən yenə, ey şuxi-girizan, sənsən.

* * *

Təəccüb eylərəm əhvali-çeşmi-xunfəşanimdən,
Bu yaş uşaqların ahı düşübdür gücdən.

Gözün yadı bu sərgərdanı əzbəs qərqi-fikr etmiş,
Bənə dərya gəlür damani-səhra mövci-ahimdən.

* * *

Bisəvad olan oxur namım ki, hər kim gözü var,
Gül kitabından oxur şəm pərişan olduğun.

* * *

Çəməndə bilməmiş, əzbəs ki, batmışlar fəğanımdan,
Qaçarlar dideyi-bəd kibi quşlar aşiyanımdan.

Qəvi bazuluğum təvizi-candur düşmən canına,
Kəmanda navəkim daim sındırar kəmanımdan.

Ərəqkeşlər ney tək nəş'ədən əzbəs ləbaləbdür,
Hüma bülbül kibi məst oldu buyi-üstüxanımdan.

Nə dudum var şövq yandırası tək, nə şərarım var,
Oda düşməsəm, degil mümkün ki, söz çıxsın zəbanımdan.

Kəlamım şəhdini görən güman etmiş bəni həlva,
Çü gördü, düşdü dami-heyrətə bədxah nişanımdan.

* * *

Töküldü badə, migani-dəşt, tar oldu dəm ondan,

Gəl, ey mütrib, nəva başla, günüm doğmuş, görüm ondan.

* * *

Düşdüm yazına oda bol zari-xəstədən,
Gördüm bəla bu ayineyi-jəng bəstədən.

Bənzər biganə yanıma könlüm atılması,
Daim yetişdi rənc bənə bu şikəstədən.

* * *

Dəxi deme çəkərəm naz bağü bustandan,
Tikan əgər əlimə girsə ol gülüstandan.

* * *

Vüsalın qədrini, bilməz giriftari-fəraq olsun,
Dimağın nəş'ədən ta var, cəhan, ya Rəb ki, çağ olsun.

Deyə bilməm nə gördüm vəsldən, çün uğradım yarə,
Bəni yandırdı bir atəş ki, düşməndən irağ olsun.

Deyərlər dərdi, min duası  müstəcab olur,
Bəni öz dərdidən bimar edən, ya Rəb ki, sağ olsun.

Özünü gözlərdən, qan eyləməkdən zəbt edə bilməz,
Müdam öz rəngi tək aşiq gərək səndən iraq olsun.

Başın örtübdür sayəban pərvanə balından,
Düşən od xanəyə lazım degil bitəmtəraq olsun.

* * *

Cismimdə rəvan qoymadı dərdü qəmi-canan,
Surət kibi gəlmiş mütəhərrik bəni-heyvan.

* * *

Ney kibi gər həmnəfəs tapsan, bəs etmənəm dadından,
Könlümü boş görmə kim, ləbrizdir fəryadından.

* * *

Tutuşdu xərməni-əql atəşi-dimağımdan,
Alışdı od o dadıma şöleyi-çırağımdan.

Alır rütubəti-meydən şüur tufanı,
Əcəb degildir əgər tər olum ayağımdan.

Bu şövqdən ki, səri-zülfi-yarə yetdi əlim,
Daraq kibi əlimi bilmənəm ayağımdan.

* * *

Yüzündən oldu şəm'i-bəzmi-rövşən yarə bənzərsən,
Əcaibdür, bir sən yarimə, qəmxarə bənzərsən.

Necə nisbət edim xurşidə ol rüxsari-rəxşanı,

Sən, ey ay üzlü, ay tək bir gülü-bixarə bənzərsən.

İşarətdən …… qala bəs ki, nazik güldür ruyin,
Şərabi-hüsndən bir sağəri-sərşarə bənzərsən.

Yoxam bən, leyk sən, ey çeşmi-canan, hiçdən incirsən,
Qəmu dərdini dersən, canü dil bimarə bənzərsən.

* * *

Daği-cünundan oldu çırağım işığü gün,
Başından könül onda düşdü durü dügün.

* * *

Ol həmin könlün götürmüşdür cəhan əsbabidən,
Durdur dünyaya aldanmaq, Vəhid, adabdən.

Duzəxi-möv'id almış gülşəni-məsti bənə,
Əjdaha ağzındadur könlüm nəfəs qıllabdən.

Çeşmeyi-heyvan xuni-meydür, şərab abi-həyat
Ruhi-Əflatun bənə peyğam edüb Farabdən.

Saqiyi-dövran yalandur, zəhrdür peymanəsi,
Qafil olma, ey dili-nadan, şərabi-nabdən.

* * *

Aşiqi-biçarəni min dərdə ağrıtmış cünun,

Başı qan, halı yəman, dərdi giran, bəxti zəbun.

Bəs ki, heyran qaldı cismim arizi-rüxsarına,
Qan tökülməz bu çanaqlardan, əgər etsən nigun.

Hər qaşı öz qüvvəti-bazusinə məğrurdur,
Baş canib bir-birilən guya vurarlar azimun.

İki misra qaşların tək çərx mövzun göründü,
Çox çevirdi gərçi dəhr övrağını nuri-fünun.

Mən anadan doğmuşam bir daneyi-nakam tək,
Vəsldən bağrım kəbabü hicrdən canım zəbun.

Demə əksidir ki, zahir oldu su güzgüsidə,
Görmüş ol qamət bu əsən sərv etmişdir nigün.

* * *

Hər yanə yüz qoya cananım, gedər can əlindən,
Cilvəgərdir kakili tək min pərişan əlindən.

Doldurur toz aftabi-aləmara sinəmə,
Gəlməz isə aşiqi-biçarə giryan əlindən.

Hər yana yüz qoysa ol qarətgəri-can nur kibi,
Aşiqi-miskin gedər üftanü xizan əlindən.

Sən gedərsən, şuxü bipərvavü miskin aşiqin,

Nəqş yayın tək qalıb toprağə heyran əlindən.

Görkəzər yarın yüzündən nuri-hüsni-sərkəşi,
Yazılırdı görsədər mehri-dirəxşan əlindən.

Ey Vəhidi-binəva, görsən əgər könlün gedir,
Bir nəfəs qatlan, gəlür ol namüsəlman əlindən.

* * *

Səhhaf oğlu başına oldu bəlayi-can,
Səhhaf qeydi kibi darıxdı bənə cəhan.

Dərdini gül kibi dərərəm, ey nihali-gül,
Əmma ki, sən aparma bənə bən xəstədən həman.

Gögə qanadlı quş kibi şövqindən uçaram,
Cana, səngligim sənə gər gəlməyə giran.

Xamuş şəm kibi sənasından olmanam,
Dildən gər salarsa bəni vəsfi an dəhan.

Dündən bəni çıxardı bu şöleyi-şəm tək,
Bir biəman yanar od imiş yar, aman, aman.

Bir candan ötrü yar buraxmağı girdədir,
Rəngim qaçaq verəndə bənə çox gəlür peyman.

Rəngim kibi qayıtsa əgər mürd namə bir,

Səndən boyundur gətirdür nameyi-aman.

Göz yaşı yarıma yaşaran dərdimi dedi,
Gör, gör, bənə nə eylədi bu tifli-bizəban.

* * *

Bu nə üzdür, bu nə gözdür, bu nə əbrudur bu,
Bəni divanəvü rüsvayın edən budur, bu.

Od salub canlara imanları qarət edici,
Bağrı qan, könlümü qəmdən etsən, sudur bu.

Könlüm ayinə kibi xirə edər didələri,
Ta ki, xurşidrüx xuyinə qarşudur bu.

Bu qara  gözlü cavandır günümü qara edən,
Gecələr yuxumu gözdən aparan budur, bu.

Gəzmişəm başdan ayağa dünə-günə, bu günə.
Bu nə çeşmu rüxü xalü xətü əbrudur bu.

Bilmənəm bən nəsəbini, ol adını, leyk
Könlümü seyd eləyən türki-cəfacudur bu.

Tutmuşam çox bəni qarət səranın ahın,
Çəkmişəm oxları sinəmdə, tərazudur bu.

Sirmə xamuş edə bilməz, bilsənə kim nədir,

Qul olaram gözlərinə, türfə süxəngudur bu.

Bitərəhhüm durucu, öldürücü, qan edici,
Dərbədər, qapıbəqarı salıcı budur, bu.

Gəlməmiş yanıma daim bən özümdən gedərəm,
Yaralardan bilürəm, ol güli-xoşbudur bu.

Businə salur ayağdan baxışı mar kibi,
Görən onu deyər, əlbəttə ki, cadudur bu.

Səni hər kimsə ki, gördü, dəxi görməz özünü,
Nə yerişdir, nə baxışdır, nə güli-rudur bu.

Yetdi hər buyinə gülzari-rüxi-canandan,
Qönçə tək ağzından artıq nə əcəb budur bu.

* * *

Əsiri-eşqsən, qurbanınam, miskinligim görmə,
Yaşurma xalını bəndən, yaşursan həddəq aşurma.

Gəda ər ayinə tək etmiş bəni pak öz vücudundan,
Gəl üz gülər tağına cana, arada heç bəni görmə.

Məhəbbət atəşi-suzəndədir, bu odda daş durmaz,
Sən ey gülbərgi-tər, bu şölə ilən durma, oturma.

Nigahi-sərkeşi-canandır, ey dil, baisi-qəndin,

Bu damın riştəsini nazik yəqin görüb badə vermə.

Edər atəş tili təqrir daim dudi-əhvalın,
Ələ al gözünü, ey səngdil, bəndən xəbər sorma.

Əgər bir ruyi-atəşnak görsən, dil ona verme,
Var isə, filməsəl, güriz et, oda tapşurma.

Fəğan kim, heçdən incər xatiri-bimar, nazikdir,
Demək olmaz ki, yarın çeşminə kim, könlümü azdurma.

Vəhidi-xəstəcan ol ey canına könlünü vermiş,
Xudavənda, bu nisyan taqdən bu könlü əndərmə.

* * *

Əgər xurşid, əgər məhdür, olu canan rizasına,
Böyüklük gər satarsa yarımız Yusif bəhasına.

Verə hər kim inani-ixtiyarın badə …,
Yapışmışdır əli daim səbu tək öz liqasına.

Çıxışmaz qiymәti-businə nəqdi-canımız, əmma
Deyibdir bu sözü miskin könül ömrü bahasına.

Çü gül kibi açılsa, nükhəti-gül tək çıxsa canım,
Degil töhmət ki, canım bağıdur bəndi-qəbasına.

Degil laiyq ki, bari peykər deyim qəmzə, vəli bənzər,

Bu mə'nidən ki, ömrüm tək yürək etməz qəfasına.

Tüyuri-dil tağabın yüzdən etdin xəlqi-divanə
Çək əl zülfindən axır sən, olubsan tari ayisinə.

* * *

Qulaq as, as qulağından sərv tək deyər aşiq,
Tamaşadır, tamaşa, çün gəlür divanə-divanə.

Ver gərdunə dunə hali, bica degil, bica,
Götürmüş balü pərdən şəm'inə viranə-viranə.

Satılmaz göftguyi-eşq cövrün mən-mən,
Gövhərdü satmanda verən olur pərvanə-pəranə.

Çəkilmişdir vərəq tək qətrə-qətrə gövhəri-əşkim,
Tökər şimdi gözüm ki, daməninə, gah damanına.

Qübari-rahi-canan gər edəm, bica degil, naseh,
Cünundur bir belə aşinavü əql biganə-biganə.

Deyərsən səbrini əldən vermə, yenə verdin,
Gedüb bax-bax, onu gör-gör, gəlür sallanə-sallanə.

Çəküb sağər gül etmiş şəm'i-bəzməfruz rüxsarı,
Genə bülbül olubdur məclisi-vəslində pərvanə.

* * *

Göz yumub ta etmədim rəğbət ziyadə yarimə,
Oldu müjganım kilidi vura qifl didəmə.

Yeritmə, uğratma könlün, hər nə ol, qəm yemə,
Var isə çək qələm gər bilməsən, yəni həmə.

Axmasın gər suyu, axmaz, onu bilməz, bilməsin,
Rəmdən ürkə, çün yeməz bir zad bu dadımda rəmə.

Şadlıq əşkinə bənzər, giryədən et ehtiraz,
Vəsmə nilidür, nə nisbət leyk əhli-matəmə.

Çün şişeyi-tari-zülfi-yar zəif etmiş bəni,
Vermənəm bu zə'fimi tarın tüki tək aləmə.

Təvəccöhlük etmiş Vəhidi-xəsteyi-kudək, vəli
Onu al tale ki, məşuqin dodağını əmə.

* * *

Sənin şirin ləbin vəsfi ola hərgəh zəbanımda,
Dilim ol didəsiz yarpaq nalə bənzər dəhanımda.

Sönməz atəşi su qaynarsa sənin atəşindən,
Gözüm qan tökdü, qəm əksilmədi bu odlu canımda.

Bənə hərgah olsam xəsmə qalib, rəhm qalibdir,
Çün düşmən əczini gördü, çəkildi ox kəmanında.

Günəş tək şami-hicri etdi gündüz naleyi-zarım,
Məgər ol atəşin təl'ət mütəsəvvirdir fəğanımda.

Qübar olsun bənimlə gər ləbi-ləlin həman, cana,
Dəhani-nalədir ney kibi dağın üstüxanında.

* * *

Afəti çoxdur kəmalın, etmə təhsili-kəmal,
Bal arısı tək evi olmaz ki, viran olmaya.

* * *

Kədu basın kəsüb, sağər edüb, cismü candan keçdim,
Şərabı qoymanam əldən, kədü başına and içdim.

* * *

Mərd əldən fürsətin, əlbəttə, verməz düşmənə,
Tiğ tək ağzı olan arxa çevirməz düşmənə.

* * *

Fəğani- nimşəbim xəsmə kar gər düşməz,
Qoyun boğazlamaq olmaz quşun bıçağı ilə.

* * *

Nə ehtimal ki, yüz bin şərar bir köz ola,

Çıxan sənin ağzından neçəsi bir söz ola.

* * *

Günəşsən, gözlərim nuri, yəmandan yaxşını seçməyə,
Sinəmdən, qəddi yay olmuşlardan ox kibi keçməyə.

* * *

Bu canımı gər istəsə canan, gülə-gülə,
Mey şişəsi kibi verərəm can, gülə-gülə.

* * *

Lazım olmuş naleyi-bülbül tək dili-divanəyə,
Gəldi gül, gəlmək gərək mey şişədən peymanəyə.

* * *

Böylə gül fəslində seyri-bağə getmək badəsiz,
Öylədür kim tövbəli adəm girə meyxanəyə.

Qoyma acı badəni, bil cani-şirin qədrini,
Gör nelər su içimi yaz mövsümündə danəyə.

Tapşırır öz yarının xaki-kəfi-payinə can,
Çox degil bica əgər rəşkim gələ pərvanəyə.

Yarı istərsən təmə kəs qövmdən, qardaşdən,

Bu əli şümşaddən kəsmək veribdür şanəyə.

Gər bənim hali-xərabim fikrinə düşsə nola,
Eyb etməzlər düşərsə gün əgər viranəyə.

* * *

Yapışıbdur bu kəbab olmuş könül eşq oduna,
Su damırkən böylə yapışmaz otlar ayinəyə.

Başı pünhan eyləməz göz bir yerə qoymaq, Vəhid,
Nəf edə ləb bağlamaq gər naleyi-məstanəyə.

* * *

Kaş canan lütf edüb atəşimi söndürməyə,
Gögdəkilən yerə ol bədxünu endirməyə.

Bağrıma daş bağlayıb xamuş urmuş dağ tək,
Dinmənəm qəmdən, bəni ta özgəsi dindirməyə.

Çapmaq istər bu sınıq qəlbimə biiman rəqib,
Özünü, ey kaş, şeytan atına mindirməyə.

* * *

Gül çəmənə kim ola, şəm əncümənə kim ola,

Rəvani-mey kim ola, ömrü cani-mey kim ola.

Nigar sərxoşü bən lalü qəsir, bipayan,
Deyən kim ola bu əhvalı, deməyən kim ola.

Başına cövrlü min ərzi-hal edəndə deyər,
Dönə-dönə bənə bu dərdi-sər verən kim ola.

* * *

Hər kim gülər, üzlü anadan gəldi zühura,
Yanmış çörəği lalə kibi düşübdü tənura.

* * *

Ola bilməz şaxi-nazik tairə apamgah,
Ondan ötrü xublər quşu qonmaz aşiqə.

* * *

Ömri-güzəştə daməni asan düşər ələ,
Düşsə vüsal daməni gər bixəbər ələ.

Surət tək özümü çəkərəm bəzmi-vəslinə,
Bir qıl başicə yol düşər olsa əgər ələ.

* * *

Bu nalədən sənə gər bir əsər gələ, nə ola,
Bu şölə  mədənidən bir şərər gələ, nə ola.

Sirişkə seyri-gülüstandan olmuşam razı,
Təmam qətrəsi ləxti-cigər gələ, nə ola.

Dirilətməz bəni, gər vəsl müjdəsin eşidəm,
Kitabəti tək əgər bixəbər gələ, nə ola.

Gözüm bulaqlaridən xuni-dil axar şəbü ruz,
Bu yaş uşaqlara rəhmin əgər gələ nə ola.

Füruği-mehri-gəda rövzəninə gündə düşər,
Vəhid külbəsinə hər səhər gələ, nə ola.

* * *

Yara bənzər xublardan kimsə yoxdur aradə,
Bir dəxi onun kibi şayəd ki, bənizi yaradə.

Göftgu birlə yaraşmır yari-meygun ləbləri,
Bir gecə gər olmaya çaxır ayağı aradə.

* * *

Bir nişandir ələmimdən ki, düşübdür dilimə,
Şeir bəhri ki, sığa cədvəli-təngi-qələmə.

Təngdəst olduğumun şərhi həmin … ki, neyləyək

Bir qıl tək başidən əzraqdır, girməz ələ.

Dərdü möhnət çəkici xülddə yoxdur dedilər,
Ruyi-xubin bəni, ya Rəb, yenə uğratdı qəmə.

* * *

Bənə də gər baxsa sənin barü xəşm etsən, nə ola,
Görəndə sən bəni bir zəhri-çeşm etsən, nə ola.

* * *

Aşiqi-ruyin əgər hicran çəkə, gər can çəkə,
Yeg ki, bir canandan ötrü məstdir, yan çəkə.

Dəf'i-düşmən bənə düşmən gəlür daim giran,
Yarəli adəm kibi kim, yarədən peykan çəkə.

* * *

Dağlu canım güvənər öz baharü bağına,
Ər məndə görünsə kuhkən öz dağına.

Çünki yoxdur bu hisari-üstüvarın qapısı,
Su yolundan gəldi hər kim gəldi dünya bağına.

* * *

Gəldi yaz, qızdı hava, dündən, gərəkdür gül çıxa,

Çünki dündən çıxdı gülü səngdən gərək bülbül çıxa.

* * *

Oldu sərxoş, çəkdi canan sağəri-mey adıma,
Bu yanar od kül bəni etdi, çü düşdü yadıma.

* * *

Qönçə tək mehri-ləbimdir göftgu ta açıla,
Düşmüşəm qəm qeydinə, açılmaya, ya açıla.

Qönçə könlü bülbülün açıldı aşiq çeşmi tək,
Gül nə mümkündür səni çün gördü bica açıla.

Bağda gəzdirən dirəng çağlarda ol miskin qəzal,
Qönçeyi-nərgis nə mümkündür ki, bica açıla.

Boyi rüsvadır, bəsi çün qönçəsi xəndan olur,
Aşiqin canı çıxar çün bu müəmma açıla.

İstərəm hərgəh gülümsə özümə zəxmi-dilim,
Bu ədadın qönçəsi ha açıla, ha açıla.

Vüsəti-imkanı qəm etmiş bənə künci-qəfəs,
Açıl, açıl, açıl, açıl, ta ki, səhər açıla.

* * *

Tapar əhdi şəbabın pir olan meykeş ayağ ilə,
Gər etmiş aftabı tapmaq olursa çırağ ilə.

Gəlür acı və leykən mey kibi çəkmək gərək nazın,
Bizimlən gərçi saqi söyləşür daim dimağ ilə.

Cəhanın hasilini alə-alə qeyrini tapdım,
Taparlar necə kim, etmişlər yeg mərdüm sorağ ilə.

Sığışmaz mehri-üqba mehri-dünya ilə bir yerdə,
Necə kim, aşiyan tutmaz hüma bir yerdə zağ ilə.

* * *

Gəldi yaz, qızdı hava, dündən gərəkdür gül çıxa,
Çünki dündən çıxdı gül, dindən gərək bülbül çıxa.

Həqdə xət şayəd dili-şeyda qulağına çəkə,
Bilmənəm kim öhdəsindən zülfi, ya kakül çıxa.

Xaki-rahindən nola çün gəlsə ol rəşki-bəhar,
Gül kibi, sünbül kibi qumru çıxa, bülbül çıxa.

Qarətlik qədri yıxar axır bükülmüş qamətim,
Yaş daşqundur inanıma, öhdəsindən bel çıxa.

* * *

Sözi özi cövri naseh, netdi kim vermiş bizə,
Görmüşəm, acıdırü şirinü şurü biməzə.

* * *

Üzüldü rişteyi-can gərçi cövründən behəmdüllah
Ki, bir-birindən üzülməz karvani-ləxti-dili-parə.

* * *

Bəni xar eyləmə, gəl bəndən, ey gülpirəhən, keçmə,
Əgər bən keçmişəm canımdan, ey birəhm, sən keçmə.

Əgərçi oxların tək keçdi bəndən xoş peyvəndim,
Keçən keçdi, keçmək vəqtidir, nedirsən keçmə.

* * *

Seyd üçün səyyadi-mürğan danə səpmiş danə tək,
Salmış ol mürği-behişti-aşiqin ağızlara.

* * *

Olur qəbulundur ləbim, can, sölə billah,
Ey afəti-can zəhrin, iman, sölə billah.

Ol qan içici, cövr edici nərgisi su, xüşk.
Qətlimdən olubdurmu peşiman, sölə billah.

Ol tərbərg səmən içrə nə istər,
Zülmətdə nədir çeşmeyi-heyvan, sölə billah.

Cənnətdir üzü, cani-əşki çeşmeyi-kövsər,
Yegdürmi can, ya ki Sifahan, sölə billah.

Hər tardə bir şəhrə könül cəm olubdur,
Zülfün nədurur munca pərişan, sölə billah.

Müjgan oxunu qaş yayına qəsdinə qoymuş,
Vurmazdan oldu peşiman, sölə billah.

Hökm etdi könül quşlarına muyi-miyanın,
Bu mur nədən oldu, Süleyman, sölə billah.

Kuyində Vəhidin dili-zarı necə oldu,
Ey can sölə, ey can, sölə, ey can, sölə billah.

* * *

Yusifi gər satsa idi, olar idim müstəri,
Alır idim nəqdi-can birlə anı, peyğəmbəri.

İstərəm rəngimlə ruyini mütəlla eyləyim,
Var bənimlə yarım arasında cəngi-zərgəri.

Aftabi-sübhi-məşhər kibi etdi mey tülu,
Div oldu şişədən çün bəstəri qəsdi nərmi.

Verürəm xaki-kəfi-payinə ixlas ilə can,
İşimi bilməm niyə böylə tutubdur sərsəri.

* * *

İsayi-Məryəm kibi ehya edüb sərsər bəni,
Lütf edübsən, zəhri-xəşminlə, gögərdübsən bəni.

* * *

Bərq tək bəndən keçər, hər ki, gəlür xərmən kibi,
Dust bəndən istər idim keçməyə düşmən kibi.

Hər qədəm əhdi-şəbabım rubəru olur düçar,
Başına guya keçən ömrüm dolanır bən kibi.

* * *

Novbahar oldu, yenə gülzar bülbül xoşladı,
Əql tək hər başa zinət olmayan gül başladı.

Dişlədi sağər dodağın, zahidi-xəlvətnişin
Qurumuş bərgi-xəzan tək xüşkrəng gül daşladı.

Şaxi-gül tək rindi-meykeş sahəti-gülzardə,
Keş verüb, başın açub, sərxoş olub, zöhd sərkeşlədi.

Yudu mey suyu qılıb xəlqi-aləmdən nifaq,
Gördü Yusif Həzrəti-Yəqublan qardaşladı.

Ol qədər duydum ki, düşdüm xakə, əya düşmədim,
Bəni yarım oxladı, ya gözlədi, ya qaşladı.

Nemәti-әsmardәn doldu çükufә kasәsi,
Bağban ta sәhni-gülşәndә nihalın işlәdi.

* * *

Bәnә bir maç verüb canan, gәrçi ağzı yoxdu,
Maçı әmma yox ağzın ağzıma artuxdu.

Çün hekayәt istәrәm çeşmü dәhanından deyәm,
Söylәrәm, Xuda, biri vardı, biri yoxdu.

Gәrçi yay mümkün degil hәrgiz ki, oxlardan ola,
Ol müqәvvәs qaşları hәm yay, hәm oxdu.

* * *

Oxşatma heç kimsәyә, zinhar, yarımı,
Tale gәlişli, ruh gedişli nigarımı.

Çün tari-әnkәbüt bәni tarü mar edәr,
Nәqqaş әgәr çәkәrsә bu cismi-nizarımı.

Mәcnun olub mәnimlә biyabana baş qoyar,
Naseh әgәr görәrsә bu qanlu baharımı.

Bәn tәk ki, aşiqәm ona, aşiq olur bәnә,
Görsә bәnim nigarım әgәr ruyi-karımı.

Su tək bu binəva tələbinə rəvan olur,
Ol səngdil eşitsə çü əfğani-zarımı.

Naqisligim nigarımı bədri-təmam edər,
Gül-gül olur görərsə əgər xar-xarımı.

Oynar, rəvan olur cilvəndə qübar tək,
Çeşmi-güli-piyadə çü görsə səvarımı.

Bir cam busə ver dəhənindən bənə bu gün,
Sındırma şişeyi-dili, sındır xumarımı.

Azdırdı dildən mayeyi-xoşhalı müdam,
Etdi çırağі-xəlvəti-işrət şərarımı.

* * *

Əldən çıxarmış dilbərim sərrişteyi-tədbirimi,
Sərgiran omluş bənimlə, bilmənəm təqsirimi.

Gedə bilməz zə'fi-təndən səfhəsindən surətim,
Suyə surətgər çəkər olsa əgər təsvirimi.

Biməhaba xəttinə ol səbzi-xət dərsi-təraş,
Çayqunə vermiş cəfa çü xətti-Kəşmirimi.

Qanlı yaş tökdüm cəhanə, oda baxdım nalədən,
Badeyi-baran bildi əşkü ahi-bitəsirimi.

Bixəbər olmaq mürid etmiş bəni dildarıma,
O cəvanı kim ki, görmüşdür, görübdür sirrimi.

* * *

Çeşmi-kövkəb görməmiş bir ay rüxi-dildar kibi,
Görməmiş bir Dəcleyi-əmvac çeşmi-tər kibi.

Günə görsətməz özün, əzbəs özün artıq sayar,
Boğazın doğmasını şəm'i-şəbi-pər kibi.

Etməmiş ahın bülbül nalə ahəngim kibi,
Düşməmiş toprağa bir bərgi-həzən rəngim kibi.

Eşitdim küşməgim, cana, sənə yegrəg gəlür,
Sülh sözü qaçurur bəndən səni cəngim kibi.

Gərçi aşubi-cəhandur, bilmənəm, ya Rəb, nədən,
Yarə şirin gəlməmişdür çün dili-təngim kibi.

Şöhrətin bainki olmuş şöləvər bu xardən,
Təngdür, ya Rəb, nədən namım sənə bikəm kibi.

Şir əgər olsam əgərçi badədən, ey səbzxətt,
Nəş'ey-mey qorxudur səndən bəni nikim kibi.

* * *

Gər huri-zülfi istə ki, vardür kəsilməsi,
Çün gördü xəttini, nə deyər bu asılması.

* * *

Bəndə etdi zülfüni hindulər kibi sünbülləri,
Atəşi-hüsni əritdi, gül kibi bülbülləri.

Şişə bir badə güldür məclisi-meyi-gülüstan,
Leyk hərgiz bisəfa olmaz dərilmiş gülləri.

Xublər halan edəndə bir qəfadan kimsənin,
Bizləri gər çəkməz isə rəngi-kakülləri.

Sərdimaği nazdırlar xubrulər özləri,
Aşiyani-murği-dildir başdakı kakülləri.

* * *

Bu oda düşməmiş ikən sözüm əbəs sandı,
Əcəb ki, xəstə könül hicrə munca qalmadı.

* * *

Vərəq-vərəq dili-sədparə oldu gəncinə tək,
Xəyali-yar ilə hərgah oyandım, yandı.

* * *

Gül üzündən çün eşitdi adımı, rəngi qaçar,

Görməmişdir gərçi ol bimehr hərgiz rəngimi.

* * *

Tutulma qönçə kibi, gül müdamlar kibi,
Oturma şişə kibi, gər gülün biyar kibi.

Xəlqə acı sözlərin şirin gəlür kibi,
Bir ağızlı dil əgər ağzında var xurma kibi.

Aldı yer kim, inziva küncündə məskən eylədi,
Aləmi şöhrət qanadı altına ənqa kibi.

Xaki-kuyindən gələn çağlarda can verməsəm,
Bən özümə sığmanam bu şövqdən dərya kibi.

Gərçi təsiri-həva şuridəhal etmiş bəni,
Sakinəm …… bir munca xara kibi.

Gərçi ruyi-sadədən qeyri yoxumdur bir kitab,
Olmuşam məşhuri-aləm Bu Əli Sina kibi.

* * *

Gözü rövşəndir sevər hər kim nigari-piyaləni,
Dərdü qəm çəkməz, çəkər hər kimsə cami-badəni.

Kimsənin altında qalmaz şəm'dən düşmüş füruğ,
Basılır hər kim, gər istər basa bir üftadəni.

* * *

Hansı gün könlüm kibi bəndən bəla açılmadı,
Qan gözümdən hər yana saçılmadı.

Dağ çün yandırdım, əmma görmədim andan güşad,
Min dügün açılmasaydın, bir dügün açılmadı.

* * *

Nola gər alasan gül dəstəsindən xunin bacı,
Əyri xuylu, özi nazik, ləbi şirin, sözi acı.

Özündən heç yoxmudur sən sevibsən hər nə var,
Gözüm nuri, ləbim zikri, könül gülləri, başım tacı.

Demə heyranəm, olma, gözlərim nuri suz eylərsən,
Nigahi-biməhabadur dili bitab dilmacı.

Gələ bilməz yolu yolsuz, yolu rəhbərsiz sayma,
Qadır yoldan çıxarır, əbtərdir onu yol ağacı.

Nigara, qəddi yay aşiqlərindən ox kibi keçmə,
Tərəhhüm qıl ki, qalmış yolda gözü, könlüm ağacı.

* * *

Xubrulər ləşkəri bu natəvandan qaçdılar,
Bir arıq, ac qurda verməz bir suvari min quzu.

* * *

Daşü dağ eşitməyin, ya Rəb, fəğani-zarımı,
Düşmənə olan görməsin, ey kaş, ruyi-karımı.

Pəncəsi xurşidin ahımdan qovmuş hər yerə,
Necə gərm etsün müsəlmanlar fələk bazarımı.

Öldürür aşiqlərinin hər birin bir tərz ilə,
Çün bəni öldürmək istər, öldürür əğyarımı.

Atılan oxlar hədəf olan bizə uzaq dəyər,
Qanlısa bilməm bənə gər baxmaz niyə yarımı.

Səbrü eşqim halını qasid deyibdir yarıma,
Bimürüvvət qaş etmişdir uyxumu darımı.

Didəmə gəlməz əgər rizvan edə ərzi-behişt,
Yüzümə heyrət tikibdir dideyi-bidarımı.

Eşq dərdi natəvan əzbəs bəni etmiş, Vəhid,
Könlüm içində görər, hər kim baxar əsrarımı.

* * *

Şikayət etmə kim, aşiq əlindən yar dar olmaz,
Təvəccöh eyləyib canan əlindən ixtiyar olmaz.

* * *

Bu qədər bənim əlimdə çeşmi-tər ixtiyarı,
Məşuq əlindədir, könlün axtarmaz xarı.

Əfğani-zəif edən bəni mümkün degil əlac,
Səy ilə yıxmaq olmaz yel dağdan qübarı.

* * *

Bağrıma sən kibi basdım ömrlər rahət kibi,
Yarlərdən durdur, imdi gəzə ülfət kibi.

Dar cüdasından diri qalmağımız əmri-məhal,
Fövt olur hər kim ki, bir bəndən gedər fürsət kibi.

Xamə içrə dərdü qəmdən qalmamış bəndən lisan,
Bəs ki, düşməndən çəkildim, olmuşam surət kibi.

Bu pərişanlıq ki, zülfündən bənə olmuş nəsib,
Titrərəm üstündə sübhü şam cəm'iyyət kibi.

Bəs ki, dil kanına olmuşdur qəmü dərdin ləziz,
Etmədilər qəmdən girizan, olmuşam rahət kibi.

İztirabım bəs ki, hicranından olmuş bərqərar,
Didələrdə odu bitaqətligim taqət kibi.

Getmədi, hərgiz bəni hicranda yalquz qoymadı,
Görmüşəm az bir rəfiqi-mehriban möhnət kibi.

* * *

Bu şölə çün edər axır bəni kəbab kibi,
Çəkə-çəkə aparur huşimi şərab kibi.

Məhəbbətin bəni etdi siyahruyi-cəhan,
Bu məndə qaldı nişan şeri-intixab kibi.

Çü girdi mehri-rüxün çahdən, məhi-Kən'an
Çəkildi, oldu rəvan bir kənarə ab kibi.

* * *

Nə bən ki, özümü bilməz solumu sağım tək,
Zebəs ki, nəş'eyi-sağər bəni xərab etdi.

* * *

Gəlməz bənim əlimdən, saqi, bişək siyahısı,
Çeşmimi rövşən etdi bu qora tutiyası.

* * *

Kəsdi fərağ tiği, nigara, amanımı,
Yandırdı atəşi-ələmi-eşq canımı.

Yoxdur nəfəs ki, ney kibi şərhi-fəraq edim,
Gər nəfəs girər ələ, gəl gör fəğanımı.

* * *

Cins ilə mövcud əgər olsaydı, müəvvər məsmudur,
İstəmək səndən yürək qan olmamış məşrudur.

* * *

Nola gər azdıra bu gədanın dimağını,
Çağlar ki, padşahlər öpərlər ayağını.

* * *

Gərçi canım düşmənisən, bəklərəm candan səni,
Olma bərqi-xirmən aramım, ey gül xirməni.

Zülmət istər gər yanar oddur əgər abi-həyat,
Zülfdür böylə qiyamət, görsəydin cananımı.

Başa düşdüm imdi, aya, çarə yoxdur dərdimə,
Şəm' tək odlu fəğanım yandırur axır bəni.

Dust bəzmindən, iraq olsun, əgər düşsəm iraq,
Gül gözüm peykanidür, gülzar canım düşməni.

Yar birlə ixtilatım alışur pərvanə tək,
Gər girərsə əlimə bir yol mübarək daməni.

Xubrulər könlümü etdi fəna, baxma, nə sud,
Od edər nərm ahəni, əmma əritməz ahini.

Vəsl hicran kibi müşkildir bənə pərvanə tək,
Alışur od canıma, ey şəm, çün görsəm səni.

* * *

Hər kişi kim çəkməmüşdür canı hicran acısı,
Anlamaz, bilməz nədir dünyadə dövran acısı.

Bilməz isən xubrulər vəsfini, bəndən eşit,
Özləri candurlar, acı sözləri can acısı.

Dadmamış biçarə aşiq şami-hicran rəmzini,
Bilməz ol miskin nədür zülfi-pərişan acısı.

* * *

Bağrımı qan eylədin, ey dilbəri-xunxar, hey,
Yet bənim fəryadıma, bidərd hey, dildar hey.

Əndəlibəm, dərmənəm gül, gəlmişəm dərdin dərim,
Açıl, açıl, üzümə gül, ey güli-bixar, hey.

Zülfün açma, könlümü gör, yarəlidür, yarəli.
Zəxmini nasur edən, ey ahuyi-tatar, hey.

Ləblərin həm qönçə, həm gül, həm qədəh, həm badədür,
Olma, olma xari-bigül, ey güli-bixar, hey.

Gəldi, getdi novbahar, ey qönçələb açılmadın,
Səndən oldu bunca asan, istərəm düşvar, hey.

Bən səni azdırmaq istərdim, sən azdırdın bəni,
Bu nə nazü qəmzədür, ey dilbəri-pərgar, hey.

Könlüm, ey gül, çünki sən açılmadın, açılmadı,
Eylədi bədxuluğun candan bəni bizar, hey.

Gərçi işdən çıxmışam, cana, ayaqdan düşmüşəm,
Sən əlim tut, çün saldın ayaqdan, yar, hey.

Bir baxışdan gər könül daş isə edər tutiya,
Yüzinə ruzincədür, ey nərgisi-bimar, hey.

* * *

Başü candan bəklərəm ol çü pərxaşını,
Əz bəri əldən buraxır başü can yoldaşını.

Ömr çün keçdi, olur məlum qədri o mənə,
Gözdə ikən görüşür, heç kimsə görməz yaşını.

Bir qılıcdır ki, aparарlar yuxarı verməgə,
Sünbüldən sonra aparsa yuxarı qaşını.

* * *

Söhbəti-vəslində bəndən bimi-hicran varmadı,
Olmadı bir dəm ki, qorxu tiği bağrım yarmadı.

Yarım mehribanlıq etdiğimdən getmədi,
Şölə tək istəməz yeritmədən bu yarmadı.

Baxılmış tale iş bitməz imiş şöləmin,
Etsən iradı nəqdini taban axtarmadı.

Bir haçan canan göründü özdə rəngimdür badi,
Gərçi bu qorçaq qaçaq rəngini hərgiz görmədi.

* * *

Qönçədür bu lalə, denilməz görənlər dağımı,
Bu dügünlər açılandan sonra gəl gör bağımı.

Yar zülfi gər bəni toprağə yeksan eyləsə,
Yarəlilər müşk buyindən tapar toprağımı.

* * *

Acı dərdin basmışam bağrıma şirin can kibi,
Könlümün bəhrindədür, dəlinsən mərcan kibi.

Ta nəzakətdən məbada ola su şəhdi-ləbin,
Təlx oldu ağzıma, çün yetdi  şirin can kibi.

* * *

Bitəkəllüf yerdür, bilmək gərək anı, vəli,

Hər kimin adəmləri azdırmağa vardır əli.

Azdırar adəmləri şeytan kibi hər yerdə var,
Jəndə geymiş bir ağacı kibi büryandır bəni.

* * *

Aşiqləri hərçənd ki, eşq oduna saldı,
Bir naz ilə axır yarının könlünü aldı.

Qəd çəkməyi aşiqlərə şəmşir çəkibdür,
Hər kim ki, onu gördü, deyər kim, bənə çaldı.

Bən gizləmişəm püstə kibi pərdeyi-dildə,
Könlüm yarasını belə çağlar ki, sağaldı.

Gör lalə kibi şöleyi-daği-dili-rişim,
Eşq odunu, cana, deməgil hərgiz azaldı.

Gözüm işığı, bu nə bəla, çeşmi-siyəhdür,
Aləm gözümə ta gözünü gördü, qaraldı.

Bin rəng çıxar yazanı əzbəs ki, xəcildür,
Gülşəndə qızıl gül səni çün gördü, saraldı.

İnsaflıdır canü dilim, ya şişə dolsun,
Canü dilimi aldı, vəli həsrəti qaldı.

Mürği-dilim əhvalını, ey şux, alubsan,

Dedim düşərəm laçınına, biçarə yar aldı.

Bən mehrdə, ey kafəri-bimehr, Vəhidəm,
Məhparə ki, döndün bənə, su kibi sağaldı.

* * *

Şəm'dür bülbüllərin bu naleyi-məstanəsi,
Gör necə axır olur gül yarpağı pərvanəsi.

Mərdümək tək yox özündən qeyri hərgiz yarımın,
Badəsi, peymanəsi, meyxanəsi, həmxanəsi.

Yetməmiş vəqti edər təslim canın yarinə,
Gül kibi var aşiqin bir nuş zövqi, peymanəsi.

Hər dili bir söz deyər aşiqə, bir yol görsədər,
Zülf birlə həmzəban, həmdəst olmuş şanəsi.

Yox bənə hər canan, bənə içdürdigi zəhri-sitəm,
Çıxdı axır aşina bu səbzeyi-peykanəsi.

* * *

Ağzının sirrini izhar eylədi,
Sevdigim yoxdan bəni var eylədi.

Necə kim, nərgis odu xoşbu edər,
Gözləri könlümü bimar eylədi.

İstədim qəndi-mükərər yardən,
Bixəbərlikdən xəbərdar eylədi.

Tərkeşin qurşandı, belin bağladı,
Gözümə gül dəstəsin xar eylədi.

İstər idim nalə qeyri yar edə,
Etmədi, yarımı əğyar eylədi.

Ağlar kibi eylədi can görkəzin,
Çeşmi-giryanımı xunbar eylədi.

* * *

Pərvanə tək ki, canü dilim şəm'ə bağladı,
Miskin Vəhid düşməni dust çağladı.

Gün kibi tutdu yer yüzünü şəm'i-şöhrəti,
Pərvanə qandan ələmin ta ki, bağladı.

* * *

Bu od düşməmiş ikən sözüm eyb sandı,
Əcəb ki, xəstə könül hicrə munca qatlandı.

Vərəq-vərəq dili-biçarə oldu küncdə tək,
Xəyali-yarilə hərgah oyandım, yandı.

* * *

Məşuqə əyan olmaz ahim ki, fələk tutdu,
Oldum qəmi-hicrandan birəhm cəng tutdu.

Məcnun necə şərh etsün bir ahilə yandığın,
Səhrayə ayaq basdı, yarını çiçək tutdu.

* * *

Gəldi, gördü, gözlədi, etdi, dolandırdı bəni,
Əglədi, əgdi, əritdi, bükdü, yandrdı bəni.

* * *

Var vücudi-bimisalın ruzigar asayişi,
Qəddinə peymanəlikdür cameyi-fərmayişi.

Ruzü şəb çeşminlə bil, çoxlar dolandı, göründü,
Padşəhlərdən sənin tək təxtü tac arayişi.

* * *

Əshabi-kəhf şahımızındır köməkçisi,
Ol padşah ki, saleh onundur keşikçisi.

Məşuqü aşiq ikisi həm bəndədür ana,
Pərvanədür çırağçı, gül döşəkçisi.

Bir bəhrdür vücud kibi onda bənzəyən,
Badi-muraddur nəfəsü dil körükçüsü.

Övraqi-gül onun çörəgidür xəlayiqə,
Görmüş tənuri bazar çörəkçisi.

Rüxsari-yari ta quruda çeşmi-rüxümdən,
Atəşdə hər sipənddür anın tüfəkçisi.

* * *

Necə oldu deyirsən, ləxti-dil saçıldı, saçıldı,
Hərgiz olursan əşkindən açıldı, açıldı.

Gözümə çün inayət eyləyub, cana, qədəm basdın,
Didəmə boldu siyah dərdü qəm, basıldı, basıldı.

Əgər, ey novbaharım, istəyirsən üqdeyi-dildən,
Gəlürkən ol dügünlər lalə tək açıldı, açıldı.

Bənə həmvar oldu Kuhkən rahi-fərağımdan
Ki, dağın qarəsi tək dağlar dağıldı, dağıldı.

Yetişdi muradə aqibət məqsudi-əqsayə,
Bu yolda bəs ki, can könlüm kibi eylədi, eylədi.

Şərər tək kağız içrə girmə çox, ey fikr, başımda
Ki, dildə dağdan muy tək sayıldı, sayıldı.

Səni bildi özündən, bu səbəbdən almadı könlün
Ki, tari-zülf tək muyin satıldı, satıldı.

Bəni ondan xəbərdar eylədi bu bixəbər olmaq,
Bu meydən məst çün oldu Vəhid, ayıldı, ayıldı.

* * *

Demə ol bivəfa kimdir, nədir ol bəxti-vajguni
Ki, hüsnün tək tutardı rəhini çeşmi-pürxuni.

Əgər namım qayıtmış parəsindən, küsmənəm səndən,
Anı yarmış qilafi-tiğ kibi qanlı məzmuni.

Təəccüb etmə, ağzı, ya dodağı gər görünməzdür
Ki, çeşmi-xəlqdən an həm gərək məxfi ola canı.

* * *

Gər əhulə yoluxsa bu şıltaqçı getdi,
Artıq səni gördügim olur göz cəriməsi.

Açdı vaiz ağzın, öldürdü bizi avazəsi,
Kaş ki, açılmayaydı bu dövlət dərvazəsi.

Qazi ruyi-tərəbdür sağəri-gülguni-mey,
Eyşi bir məcmuə tarixindür şərarəsi.

Gəh nədən döndərdin keçərsən, keçmə cami-badədən,
Xoş gəlür gər köhnədürmi göftguyi-tazəsi.

Mövci-çərxişdən hərçənd payan görmədim,
Leyk bipayan göründü eşqi-biəndazəsi.

* * *

Dəşti-məhşər aşiqə kim mim gözü tək təng olur,
Qarəsin gəh salacaq olursa daği-tazəsi.

* * *

Edüb Məcnun ayağı xardən riş ari,
Gəzərdi naqə daim xar ara, şimdi arar cari.

* * *

Görsədim bən sənə bağrım parəsin yarəsini,
Canımın parəsindən gör ürəgim parəsini.

* * *

Gəldi, qucdu, üzümə görsəndi, söndürdü bəni,
Bükdü bir mərdümək sarı əzbəs qucundurdu bəni.

* * *

Gəlibdür küsməgim, seyr etmədüm ol şuxi-rənanı,
Tamaşayi əgər üz verməsə, gəl gör tamaşanı.

Ölüm damanını ruzi-qiyamət duymasın, ya Rəb,
Bu günlərdə əgər görməmişəm bən şuri-fərdanı.

Bənim nəqdi-həyatım hüsni-vəsliçün giramidür,
Yetürməz gər bəni cananımdan, neylərəm canı.

* * *

Düşmüşəm gözündən sənün, rəngim deyər əhvalımı,
Zə'fdən nəqqaş həm müşkil çəkər timsalımı.

* * *

Ömr dəgməzdi bir məmurə əmma,
Vəli bir parəsi qiymətsiz endi.

* * *

İstərəm açılmasın hərgiz məhəbbət qapısı,
Açılır, ta açılıbdır dərdə möhnət qapısı.

Çün dügünlər köksdə açıldı suzi-eşqdən,
Bağlanır aşiqlərin üzünə möhnət qapısı.

Könlümüz oları, cana, çox yavuqdur hər yerə,
Aramızda açılır axır məhəbbət qapısı.

Dağlardan yol tapıb girdi xəyalı könlümə,
Bu dügündən yüzümə açıldı cənnət qapısı.

Ey Vəhidi-xəstə, məşuqin mürüvvətsiz degil,
Yüzümə bağlanmadı hərgiz mürüvvət qapısı.

* * *

Qanlı tərə ərəq etdi, bilinməkdə təlaşı,
Könlüm quşunun tilbəsi olmuş qara qaşı.

* * *

Novbahar olduvü divanəligim başlandı,
Könlümün şişəsi ətfali görüb daşlandı.

* * *

Doxtəri-rəzdür həlalım, xoş gəlür sirdaşlığı,
Saçıqındır gürbeyi-məstanə huşim başlığı.

Evimiz tifli sirişkim, iztirabım məhdidə,
Eyləmiş su könlümi bu tifli-bədxu yaşlığı.

